
ISSN: 1609-1620, E-ISSN: 2674-5224
P A H T E I
REFEREED & REVIEWED JOURNAL

## TABLE OF CONTENTS

E-ISSN: 2674-5224

05-12 VOLUME 23 ISSUE 12 2022



ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

# APPLICATİON OF TOPSIS METHOD TYPE 2 FUZZY SETS FOR INFORMATİON SYSTEMS PROJECT SELECTION

**Aygul Dadasheva**
Azerbaijan State Oil and Industry University, BA Programs, Employee on Educational Technologies,
http://orcid.org/0000-0002-4067-6967, Email: dadasheva879@gmail.com

## ABSTRACT

If to consider that in the group decision making a group of decision makers express their choices and preferences for the different criteria of the various alternatives and this choice is based on their knowledge about these criteria, project selection process can be complicated. The main aim of project selection is the analysis of the project and the evaluate the different projects for their various characteristics. In this paper project selection is related to Information Systems. There are 3 IS Projects and each alternative has been evaluated for their criteria which included reliability, cost of implementation, information processing efficiency, availability of skilled personnel. During the project selection the decision makers consider the different intangible and tangible factors and the analyse all alternatives and select the best alternative. In this paper TOPSIS method represented for multi-criteria group decision making in fuzzy type-2 environment. The evaluation imprecision which is modelled by the trapezoidal type 2 fuzzy number characterizes linguistic terms. In these numbers each element has their own membership which has been described with the membership function in the [0,1] interval valued.. If to review the literature about the Multicriteria Decision Making methods, we will see that these methods with the fuzzy numbers are used for handling the uncertainties. With the fuzzy ordinary numbers, the uncertainty can be handled, and the fuzzy type 2 numbers introduced by Zadeh are the ordinary fuzzy sets' extension. In this paper the TOPSIS method is applied with fuzzy type 2 sets and the steps of the TOPSIS method have been shown. The method is applied for the Information Systems Project selection problem which is nowadays has a great role in our life and the selection is very complicated because this selection problem includes tangible and intangible criteria of the alternatives.
In the paper the below mentioned sections has been shown. The methodology has been represented in Section 2. Section 3 demonstrates the application of TOPSIS method to group decision making for Information Systems Project Selection. In the application of Fuzzy TOPSIS method firstly, the decision matrix of fuzzy evaluation of each alternative has been determined and the weights for each criterion have been identified. Based on this decision matrix normalized decision matrix is constructed. Related to this matrix ideal and negative ideal solutions are determined which are used for the finding distance. Based on the distance the relative closeness is calculated and the alternatives are ranked based on these results.
In recent years, information systems project selection has become one of the important points for academic research. The methods used for the selection of information systems projects include WSM, AHP, TOPSİS, DEA, etc. includes. According to WSM, any decision-maker tries to maximize function by combining different points of view. For each criterion, weights and rating scales are assigned. Then, the alternatives are evaluated, and numerical ratings are given for each criterion of the alternatives. Finally, the product of these numerical ratings and the weight of the criterion is found, and these scores are summed to create a total result.

The TOPSIS method was also used in the selection of information systems literature. TOPSIS is a useful ranking and selection technique that selects the best alternative based on positive ideal and negative ideal solutions. In the TOPSIS technique, positive ideal solutions and negative ideal solutions are first determined for each criterion, and then the relative proximity of each alternative to these ideals is calculated. Finally, the ranking of alternatives is based on the combination of these two criteria. There is a limited number of TOPSIS applications in the field of IS project selection.
**Keywords:** TOPSIS, fuzzy type 2 sets, multicriteria, group decision making.

## İNFORMASIYA SİSTEMLƏRİ LAYİHƏ SEÇİMİ ÜÇÜN 2-Cİ TİP QEYRİ-SƏLİS ELEMENTLƏRLƏ TOPSIS METODUNUN TƏTBİQİ

**Aygül Dadaşeva**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti, BA Proqramları, Tədris texnologiyaları üzrə işçi,
http://orcid.org/0000-0002-4067-6967, Email: dadasheva879@gmail.com

### XÜLASƏ

Məqalədə İnformasiya Sistemləri Layihəsinin seçimi üçün qeyri-səlis qərar qəbuletmə metodlarından olan TOPSİS metodu ikinci tip qeyri-səlis ədədlər üzərində tətbiq edilmişdir. Nəzərə alsaq ki, qrup qərarqəbuletmə zamanı qərar qəbul edən şəxslər (QQŞ) öz seçim və öncəliklərini müxtəlif alternativlərin müxtəlif meyarları üzrə ifadə edir və bu seçim onların bu meyarlar haqqındakı biliklərinə əsaslandəğına görə və bu biliklər və məlumatlar qeyri müəyyən olduğundan, onların ədədlərlə ifadəsi və layihə seçim prosesi çətinləşə bilir. Layihə seçiminin əsas məqsədi layihələrin təhlili və müxtəlif layihələrin müxtəlif xüsusiyyətlərinə görə qiymətləndirilməsidir. Bu məqalədə layihə seçimi İnformasiya Sistemləri (İS) ilə bağlıdır. 3 İS Layihəsi mövcuddur və hər bir alternativ etibarlılıq, həyata keçirmə maliyəti, məlumatların işlənməsinin səmərəliliyi, ixtisaslı kadrların mövcudluğu kimi kriteriyalara görə qiymətləndirilmişdir. Layihə seçimi zamanı qərar qəbul edən şəxslər müxtəlif müəyyən və qeyri-müəyyən amilləri nəzərə alır və bütün alternativləri təhlil edərək ən yaxşı alternativi seçirlər. Bu məqalədə 2-ci tip qeyri-səlis mühitində çoxmeyarlı qrup qərarlarının qəbulu üçün TOPSIS metodunun tətbiqi təqdim olunur. Trapezoidal 2-ci tip qeyri-səlis ədədlərlə modelləşdirilmiş qiymətləndirmə meyarları linqvistik terminləri xarakterizə edir. Bu ədədlərdə hər bir elementin öz üzvlüyü vardır ki, bu da [0,1] intervalında üzvlük funksiyası ilə təsvir edilmişdir.
**Açar sözlər:** TOPSİS, 2-ci tip qeyri-səlis qərar qəbuletmə, çoxmeyarlı qərar qəbuletmə, qrup qərar qəbuletmə.

### Giriş

Çoxmeyarlı qərar qəbuletmə üsullarına aid ədəbiyyatı nəzərdən keçirsək görərik ki, qeyri-müəyyənliklərin azaldılması məqasədilə bu metodların istifadəsi zamanı qeyri-səlis ədədlərdən istifadə edilir. Bu ədədlərlə qeyri-müəyyənlik idarə oluna bilər və həmçinin Zadə tərəfindən təqdim olunan ikinci tip qeyri-səlis ədədlər də bu ədədlərə aiddir [6]. Bu məqalədə 2-ci tip qeyri-səlis çoxluqlarla TOPSIS metodu tətbiq edilmiş və TOPSIS metodunun addımları




göstərilmişdir.Metod hal-hazırda həyatımızda böyük rolu olan İnformasiya Sistemləri Layihəsi seçimi məsələsi üçün tətbiq edilmişdir ki,burada seçim çox mürəkkəbdir, çünki bu seçim problemi alternativlərin müəyyən və qeyri-müəyyən müxtəlif meyarlarını ehtiva edir.

**Məqsəd**

**Problemin aktuallığı və əlaqəli tədqiqatlar.** Son illərdə informasiya sistemləri layihəsi seçimi akademik tədqiqatlar üçün önəmli məqamlardan birinə çevrilib. Bu sahədə mövcud tədqiqatlar dörd əsas qrupa bölünə bilər ki, bunlar:

1)spesifiklərin məhsulların qiymətləndirilməsi və seçilməsi, 2) seçim metodologiyası 3) seçim meyarları 4) Qərar qəbul edən şəxsə kömək edən avtomatlaşdırılmış.

İnformasiya sistemləri layihələrinin qiymətləndirilməsi və seçilməsi çoxmeyarlı qərar qəbuletmə problemini formalaşdırır ki. Layihə seçimi zamanı xərc, gəlir, istifadəyə yararlılıq və s. kimi bir çox aspektləri nəzərə almaq lazımdır. Çox meyarlı qərar qəbuletmədə hər bir nöqteyi-nəzər fərqli bir meyarla təmsil olunur və alternativlər bu meyarlara uyğun olaraq qiymətləndirilir. Baxmayaraq ki, çoxmeyarkl qərar qəbuletmənin müxtəlif texnikaları vardır, lakin qərar qəbuletmənin əsas mərhələlərini aşağıdakı kimi verə bilərik: (1) Qiymətləndirmə meyarları sisteminin yaradılması. (2) Alternativlərin hazırlanması. (3) Alternativlərin meyarlara əsasən qiymətləndirilməsi. (4) Çoxmeyarlı analiz metodunun tətbiqi. (5) Optimal alternativin seçilməsi

İnformasiya sistemlərilayihələrinin seçilməsi üçün istifadə olunan üsullara WSM, AHP, TOPSİS, DEA və s. daxildir.

WSM-ə görə hər hansı bir qərar qəbul edən şəxs müxtəlif nöqteyi-nəzərləri birləşdirərək, dolayısı ilə funksiyanı maksimuma çatdırmağa çalışır. Hər bir meyar üçün, çəkilər və reytinq şkalaları təyin edilir. Sonra isə, alternativlər qiymətləndirilir və alternativlərin hər bir meyarı üçün ədədi reytinqlər verilir. Sonda isə, bu ədədi reytinqlərin meyarın çəkisi ilə hasili tapılır və bu ballar ümumi nəticə yaratmaq üçün cəmlənir.

TOPSIS metodu informasiya sistemləri ədəbiyyatı seçimində də istifadə edilmişdir. TOPSIS sıralamaq və seçmək üçün faydalı üsuldur ki, bu üsulla müsbət ideal və mənfi ideal həllərəsasında ən yaxşı alternativ seçilir. TOPSIS texnikasında əvvəlcə hər bir kriteriya üçün müsbət ideal həll və mənfi ideal həllər müəyyən edilir, sonra hər bir alternativin bu ideallarla nisbi yaxınlığı hesablanır. Sonda alternativlərin sıralanması bu iki yaxınlıq meyarının birləşməsinə əsaslanır [7]. İS layihələri seçimi sahəsində məhdud sayda TOPSIS tətbiqi mövcuddur.

**Metodlar**

Bu məqalədə 2-ci qeyri-səlis ədədlərə əsaslanan qrup qərar qəbul etmə yanaşması [1] və TOPSİS metoduna əsasən İS layihəsinin seçimi öz əksini tapmışdır. Bu bölmədə seçmə üsulunu aydınlaşdırmaq üçün əvvəlcə 2-ci tip qeyri-səlis çoxluqlar, sonra isə metodun addımları izah edilir[4].

Qeyri-səlis çoxluqlar nəzəriyyəsi riyazi olaraq qeyri-müəyyənliyi təmsil edir xüsusi olaraq hazırlanmışdır və bir çox problemə xas olan qeyri-dəqiqliklə məşğul olmaq üçün hesablama təqdim edir. Qeyri-səlis çoxluqlar qərar prosesində təxmini məlumat və qeyri-müəyyənlikdən istifadə etməyə imkan verir. Belə ki, bilik qeyri-səlis çoxluqlarla daha təbii şəkildə ifadə oluna bildiyindən, bir çox mühəndislik və qərar problemləri bu üsulla rahatlıqla həll edilə bilər. Beləliklə, bu məsələlərin xeyli sadələşməsi və təkmilləşməsinə gətirib çıxarır. Beləliklə, bir çox ədədi analiz üsulları var ki,ölçülmüş və işlənmiş dəyişənlərdə və parametrlərdə qeyri-dəqiqliyi ehtiva edən real dünya problemlərinin həlli üçün qeyri-səlis çoxluqlardan istifadə etməklə

ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 23 ISSUE 12 2022

genişləndirilmişdir. Müxtəlif çoxmeyarlı qərar qəbuletmə üsullarının daha faydalı olması üçün linqvistik dəyişənlərdən istifadə zamanı bu üsullar genişləndirilir. Linqvistik dəyişənlər təbii dillərdəki "yaxşı", "orta" və "pis" kimi sözləri öz dəyəri kimi qəbul edə bilən dəyişənlərdir [2]. Bu linqvistik dəyərlər dəyişənin müəyyən olunduğu diskurs aləmində qeyri-səlis çoxluqlarla xarakterizə olunur. Ədəbiyyatda bu linqvistik dəyərlər S-şəkilli, üçbucaq, trapesiya şəkilli müxtəlif geometrik fiqurlarla ifadə olunan mənsubiyyət funksiyaları ilə təsvir edilir. [3]. Məsələdə istifadə olunan linqvistik dəyişənlərin 2-ci tip qeyri-səlis ədədlərlə ifadəsini göstərən cədvəl aşağıda verilmişdir:

**Cədvəl 1.** Linqvistik dəyişənlərin 2-ci tip qeyri-səlis ədədlərlə ifadəsi

| Linqvistik dəyişənlər | 2-ci tip qeyri-səlis ədədlər şkalası |
|---|---|
| Çox Yüksək | (7,8,9,9;1) (7.2,8.2,8.8,9;0.8) |
| Yüksək | (5,6,8,8;1) (5.2,6.7,8,8;0.8) |
| Orta | (3,4,6,7;1) (3.4,4.2,6,6.8;0.8) |
| Yaxşı | (1,2,4,5;1) (1.4,2.2,3.8,4.8,0.8) |
| Eyni | (1,1,1,1;1) (1,1,1,1;1) |

$A$ - X diskurs kainatında üzvlük funksiyası ilə təmsil olunan 2-ci tip qeyri-səlis çoxluqdur.

$$A_\alpha = \{((x,u),\mu_A(x,u)) \mid \forall x \in X, \forall u \in J_x \subseteq [0,1], 0 \le \mu_A(x,u) \le 1\} \quad (1)$$

Aşağıda göstərilən Şəkil 1-də trapezoidal 2-ci tip qeyri-səlis çoxluq nümunəsi göstərilmişdir.




**Şəkil 1.** İkinci tip qeyri-səlis ədəd

Aşağıdakı məsələdə ardıcıl cüt-cüt müqayisəli matris təqdim olunur [5]. TOPSIS metodundan istifadə edərək ən yaxşı alternativ seçiləcək. Aşağıda göstərilən matris ikili müqayisəli matrisdir:



ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

$$\tilde{A}_{ij} = \begin{bmatrix} 1 & \tilde{A}_{12} & \dots & \tilde{A}_{1n} \\ \tilde{A}_{21} & 1 & \dots & \tilde{A}_{2n} \\ \vdots & \vdots & \ddots & \vdots \\ \tilde{A}_{n1} & \tilde{A}_{n2} & \dots & 1 \end{bmatrix}$$ number

Alternativlərin kriteriyalara əsasən qrup qərar qəbuletmə nəticəsində 2-ci tip qeyri-səlis ədədlərlə qiymətləndirilməsi Cədvəl 2-də göstərilmişdir:

**Cədvəl 2.** Alternativlərin kriteriyalar üzrə qoymətləndirilməsi

| | A1 | A2 |
|---|---|---|
| C1 | (0.004;0.01;0.042;0.11:1,1)<br>(0.005;0.011;0.035;0.091:0.8,0.8 | (0.005;0.012;0.05;0.13:1,1)<br>(0.006;0.013;0.042;0.1:0.8,0.8) |
| C2 | (0.011;0.021;0.074; 0.17:1,1)<br>(0.013;0.024;0.064; 0.14:0.8,0.8) | (0.002;0.005;0.02; 0.049:1;1)<br>(0.003,0.006,0.017,0.040;0.8,0.8) |
| C3 | (0.017,0.043,0.16,0.36;1,1)<br>(0.022,0.050,0.14,0.30;0.8,0.8) | (0.012,0.030,0.12,0.29;1,1)<br>(0.015,0.035,0.10,0.23;0.8,0.8) |
| C4 | (0.009;0.001;0.007;0.025;1,1)<br>(0.001;0.002;0.006;0.0018;0.8,0.8) | (0.001;0.002;0.011;0.03;1,1)<br>(0.001;0.003;0.006;0.027;0.8,0.8) |

| | A3 |
|---|---|
| C1 | (0.017;0.04;0.16;0.38:1,1)<br>(0.02;0.046;0.14;0.31:0.8,0.8) |
| C2 | (0.002,0.004,0.015,0.037;1,1)<br>(0.002,0.004,0.012,0.030;0.8,0.8 |
| C3 | (0.005,0.012,0.056,0.15;1,1)<br>(0.006,0.014,0.048,0.12;0.8,0.8) |
| C4 | (0;0.008;0.035;0.01:1,1)<br>(0.004;0.009;0.03;0.078:0.8,0.8) |

Qeyri-müəyyənliyi daha yaxşı idarə etmək üçün 2-ci tip qeyri-səlis çoxluqlar TOPSİS metodu ilə inteqrasiya oluna bilər. Bu məqalədə 2-ci tip trapezoidal qeyri-səlis çoxluqlardan istifadə edilmişdir [8]. TOPSİS metodunun mərhələləri aşağıda verilmişdir:
Mərhələ 1: Qərar verən şəxslər bir neçə atribut və ya meyar əsasında seçiləcək bəzi alternativləri müəyyənləşdirirlər. X dəyişənindəki qeyri-səlis Ã çoxluğunun mənsubiyyət funksiyası müəyyənləşdirilir ki, X-dəki hər bir x elementi [0,1] intervalında həqiqi ədəddir. $\mu_{\tilde{A}}(x)$ dəyəri Ã ədədinin mənsubiyyət funksiyası dərəcəsi adlanır.
Mərhələ 2: TOPSİS-də hər bir alternativin reallaşdırılması x-qərar matrisi ilə sıralanmağı tələb edir ki, burada i=1,2, … ,m; və j=1,2, … ,n. ***rij-*** normallaşdırılmış qərar matrisi R aşağıdakı düsturla qiymətləndirilir:

$$r_{ij} = \frac{x_{ij}}{\sqrt{\sum_{i=1}^{M} x_{ij}^2}} \qquad (2)$$

ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 23 ISSUE 12 2022

Mərhələ 3: Verilən məlumatlar qərar matrisi formasında ifadə olunur və menecerlər tərəfindən təmin edilən çəkilərlə W = (w1, w2, w3, ...,wN), ($\sum w_i = 1$) çəkili normallaşdırılmış qərar matrisləri qurulur.

$$V = \begin{bmatrix} w_1 r_{11} & w_2 r_{12} & w_3 r_{13} & \cdots & w_N r_{1N} \\ w_1 r_{21} & w_2 r_{22} & w_3 r_{23} & \cdots & w_N r_{2N} \\ . & & & & . \\ . & & & & . \\ . & & & & . \\ w_1 r_{V1} & w_2 r_{M2} & w_3 r_{M3} & \cdots & w_N r_{MN} \end{bmatrix} \quad (3)$$

$$r_{ij} = 1$$

Baxılan məsələyə uyğun çəki dərəcələri aşağıda göstərilmişdir:

| | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|
| w1 | (0.8, | 0.93, | 0.93, | 0.975:1,1) | (0.86, | 0.93, | 0.93, | 0.95:0.9,0.9) |
| w2 | (0.75, | 0.9, | 0.9, | 0.975: 1,1 | (0.83, | 0.9, | 0.9, | 0.9375:0.9,0.9) |
| w3 | (0.8, | 0.95, | 0.95, | 1: 1,1) | (0.88, | 0.95, | 0.95, | 0.975:0.9,0.9) |

Mərhələ 4: Çəkili normallaşdırılmış qeyri-səlis qərar matrisinə uyğun müsbət ideal həll A* və mənfi ideal həll çəkili normallaşdırılmış qiymətləndirmə əsasında müəyyənləşdirilir. Müsbət ideal həll matrisi (4) funksiyası ilə hesablanır ki, burada da mənfi ideal həll matrisi (5) funksiyasına əsasən hesablanır.

$$A_i^* = \left\{ (\max_i v_{ij} \,\middle|\, j \in J), (\min_i v_{ij} \,\middle|\, j \in J) \right. \\ \left| i = 1,2,3,\ldots,M \right| = \{ v_{1*}, v_{2*}, \ldots, v_{N*} \} \quad (4)$$

Mənfi-ideal həll isə, aşağıdakı kimi müəyyənləşdirilir:

$$A^- = \left\{ (\min_i v_{ij} \,\middle|\, j \in J), (\max_i v_{ij} \,\middle|\, j \in J) \right. \\ \left| i = 1,2,3,\ldots,M \right| = \{ v_{1-}, v_{2-}, \ldots, v_{N-} \} \quad (5)$$

**Cədvəl 3.** İdeal və Mənfi-ideal həll nəticələri

| | Si* | | | | Si' | | | |
|---|---|---|---|---|---|---|---|---|
| A1 | (0.60 | 0.84 | 0.84 | 0.88:1.1) | (0.14 | 0.02 | 0.04 | 0.06:1,1) |
| | 0.74 | 0.84 | 0.84 | 0.86: 0.8,0.8) | (0.03 | 0.03 | 0.04 | 0.01:0.8,0.8) |
| A2 | (0.73 | 0.88 | 0.88 | 0.95;1,1) | (0.06 | 0.06 | 0.08 | 0.10:1,1) |
| | (0.81 | 0.88 | 0.88 | 0.91:0.8,0.8) | (0.05 | 0.08 | 0.08 | 0.11: 0.8,0.8) |
| A3 | (2.53 | 2.24 | 1.99 | 2.45:1,1) | (0.00 | 0.22 | 0.19 | 0.06:1,1) |
| | (2.07 | 2.26 | 2.04 | 1.82:0.8,0.8) | (0.21 | 0.20 | 0.17 | 0.18:0.8,0.8) |

Bu məqsədlə qeyri-səlis çox faktorlu qərar qəbuletmə metodundan istifadə olunur.




Mərhələ 5: Hər bir alternativin mənfi və müsbət həllə yaxınlıq məsafələri aşağıdakı qaydada hesablanır:

$$S_{i^*} = \sqrt{\sum (v_{ij} - v_j^*)^2}, \text{ i=1,2,3,…,M,} \qquad (6)$$

Mərhələ 6: ***A*ᵢ** Alternativinin A* ideal həllinə nisbi yaxınlığının hesablanma qaydası aşağıda göstərilmişdir:

$$C_{i^*} = S_i^{'} / (S_i^* + S_i^{'}), 0 < C_i^* < 1$$

| | Ci* | | | |
|---|---|---|---|---|
| A1 | (0.80 | 0.71 | 0.70 | 0.75:1.1) |
| | (0.72 | 0.71 | 0.70 | 0.68: 0.8,0.8) |
| A2 | (0.14 | 0.15 | 0.15 | 0.14;1,1) |
| | (0.17 | 0.14 | 0.15 | 0.18:0.8,0.8) |
| A3 | (0.38 | 0.44 | 0.49 | 0.50:1,1) |
| | (0.43 | 0.44 | 0.48 | 0.54:0.8,0.8) |

**Nəticə**

İnformasiya Sistemi layihəsinin düzgün seçilməsi effektiv idarəetmə texnologiyasının əsas komponentlərindəndir. Bu məqalənin əsas məqsədi qeyri-səlis ədədlərlə TOPSIS metodu ilə ən yaxşı alternativin tapılmasıdır. Təqdim olunan TOPSİS metodunun effektivliyi ədədi nümunə ilə göstərilir. Təklif olunan yanaşmadan istifadə edərək ən yaxşı alternativ ən yüksək nəticəyə malikdir və birinci alternativ seçilmişdir.

**ƏDƏBİYYAT**

1. Zhang Z. and Zhang S. A novel approach to multi attribute group decision making based on trapezoidal interval type-2 fuzzy soft sets, Applied Mathematical Modelling.- 2013, 37, 4948–4971.
2. Ngan S.C. A type-2 linguistic set theory and its application to multi-criteria decision making,Computers & Industrial Engineering.- 2013, 64, pages 721–730
3. Chen S.M. and Wang C.Y. Fuzzy decision making systems based on interval type-2 fuzzy sets// Information Sciences.- 2013, 242, pages 1–21.
4. Chen S.M., Yang M.W., Lee L.W. and Yang S.W. Fuzzy multiple attributes group decision-making based on ranking interval type-2 fuzzy sets // Expert Systems with Applications.-2012, 39, 5295–5308.
5. Aliev, R. A., Guirimov, B. G., Huseynov, O. H., Aliyev, R. R. A consistency-driven approach to construction of Z-number-valued pairwise comparison matrices, Iran J. Fuzzy Syst. -2021, 18(4), 37-49 ()
6. Oztaysi, B. A Group Decision Making Approach Using Interval Type-2 Fuzzy AHP for Enterprise Information System Project Selection, J. Multiple-valued Logic and Soft Computing .-2015
7. Aliyeva, K. Multifactor Personnel Selection by the Fuzzy TOPSIS Method. //Adv. Intel. Syst. Comput., Springer.-2019, 896, 478–483. Doi: 10.1007/978-3-030-04164-9_64
8. Dadasheva, A.N. Analysis of consistency of pairwise comparison matrix with fuzzy type-2 elements, Lecture Notes in Networks and System.- 2022, 362, 324-330

ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 23 ISSUE 12 2022

# ПРИМЕНЕНИЕ НЕЧЕТКИХ МНОЖЕСТВ ТИПА 2 МЕТОДА TOPSIS ДЛЯ ВЫБОРА ПРОЕКТА ИНФОРМАЦИОННЫХ СИСТЕМ

**Айгюль Дадашева**
Азербайджанский государственный университет нефти и промышленности, BA Programs, сотрудник по образовательным технологиям, http://orcid.org/0000-0002-4067-6967, Email: dadasheva879@gmail.com

РЕЗЮМЕ

В статье ко второму типу нечетких чисел был применен метод ТОПСИС, являющийся одним из нечетких методов принятия решений по выбору Проекта информационных систем. Учитывая, что во время группового принятия решений лица, принимающие решения (ЛПР), выражают свои предпочтения и приоритеты в соответствии с различными критериями различных альтернатив, и поскольку этот выбор основан на их знании этих критериев и поскольку эти знания и информация неопределенны, их числовые значения выражение и выбор проекта процесс может быть сложным. Основной целью отбора проектов является анализ проектов и оценка различных проектов в соответствии с их различными характеристиками. В этой статье выбор проекта связан с информационными системами (ИС). Существует 3 проекта ИС, и каждый вариант оценивался по таким критериям, как надежность, стоимость внедрения, оперативность обработки данных, наличие квалифицированного персонала. Во время выбора проекта лица, принимающие решения, учитывают различные определенные и неопределенные факторы и выбирают наилучшую альтернативу, анализируя все альтернативы. В данной статье представлено применение метода TOPSIS для принятия многокритериальных групповых решений в нечеткой среде 2-го типа. Критерии оценивания, моделируемые нечеткими числами трапецеидального типа 2, характеризуют лингвистические термины. Каждый элемент в этих числах имеет свою принадлежность, которая описывается функцией принадлежности в интервале [0,1].
**Ключевые слова:** TOPSİS, нечеткие множества типа 2, многокритериальность, групповое принятие решений.

Publication history

Article received: 14.11.2022
Article accepted: 28.11.2022
Article published online: 19.12.2022
DOI suffix: 10.36962/PAHTEI23122022-05

E-ISSN: 2674-5224

13-20 VOLUME 23 ISSUE 12 2022



ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

# SPECTROPHOTOMETRIC DETERMINATION OF PALLADIUM (II) ION WITH 2,3,4-TRIHYDROXYPHENYLAZO 5'-SULFONAPHTHALINE REAGENT

**Esmira Hashimova**
Azerbaijan State Oil and Indusrty University, Dissertation student, senior laboratory assistant of the department of “Chemistry and Inorganic Substances Technology”, https://orcid.org/0000-0002-2668-4274,
Email: esmira.hashimova@mail.ru

## ABSTRACT

Pyrogololol-based azo compounds are widely used organic reagents for the photometric determination of a number of metal ions. Since the determination reactions based on the formation of their complexes with various ligands have higher indicators, they are of great importance for the analytical chemistry of some metal ions, especially for the photometric determination. Therefore, determining the regularities of the formation of complexes of various ligands with some metal ions in the presence of various types of third components (secondary ligands) of these reactants, and investigating the dependence of their chemical-analytical characteristics on the nature of the metal ion, reactant and third component, and on the interaction between ligands, should be considered an urgent issue. The forms of the reagents in the solution depending on the acidity of the environment were studied. At this time, it was shown that their molecular forms are even more important for complex formation reactions.
Pyragallol-based reagent was used in the work, which is not commercially available. Therefore, the reagent was synthesized by a known method. Pyragallol-based reagents used in the research were synthesized according to the methodology known from the literature. Pyrogallol used in the synthesis (purchased from "Skeron" located in Moscow), 2-hydroxy-3-sulfo-5-chloro aniline, 3-sulfo-5-nitro aniline, 2amino-5'sulfonaphthalene, sodium nitrite and hydrochloric acid "analysis clean for" and "chemically clean" quality. Synthesis of the reagent was carried out in two stages. The first step is mainly the diazoation of the aromatic amine. The second stage is the coupling of pyrogallol to the diazonium ion. Nuclear magnetic resonance (NMR), infrared spectroscopy (IR), spectrophotometric and X-ray structural analysis methods were used to obtain information about the identity and structure of the reagent.
During the interaction of azo compounds synthesized on the basis of pyrogallol with palladium(II) ion, they form colored complex compounds depending on the acidity of the environment. Considering this, in order to determine its role during the spectrophotometric determination of palladium (II) ion, the binary and complex compounds with different ligands formed by them were studied by photometric method. The spectrophotometric characteristics of the complexes were calculated. Thus, based on the light spectra, the optimal conditions of complex formation were determined, and the effect of temperature, time, concentration of the reactant and the third component on complexation was studied. It was determined that the spectrophotometric indicators of complexes with different ligands are more in comparison with c At the optimal pH, the luminescence spectra of complex compounds with different ligands and the pH dependence of the optical density at the maximum wavelength were studied . Based on the experiments, it was determined that the maximum output of these complexes pH-3 ($PdR_1$-

SPBr), pH-2 ($PdR_1$-SPCl) $PdR_1$-SPBr and $PdR_1$-SPCl complexes maximum illumination is 450, 460 nm, respectively.omplexes with the same ligand. A complex compound with different ligands formed during the action of cetylpyridine chloride and cetylpyridine bromide on the complex compound formed by palladium (II) with R1 reagent was studied. The emission spectra of complex compounds with different ligands formed depending on pH at different wavelengths were recorded it was determined that $1\cdot10^{-4}$ M $R_1$ ($PdR_1$-SPCl) and $1,0\cdot10^{-4}$ M $R_1$ ($PdR_1$- SPBr), $3,2\cdot10^{-4}$ M SPCl, $4\cdot10^{-4}$ M SPBr required.
When the complexation reaction of palladium(II) with $R_1$ reagent was influenced by surfactants, the analytical parameters of the reactions increased dramatically. The sensitivity and selectivity increase significantly, and it can be said that the lower limit of the interval of obedience to Ber's law is reduced enough. The persistence of ternary complexes is higher than binary complexes.
**Keywords:** pyragallol, SPBr-cetylpyridine chloride, SPCl-cetylpyridine bromide, 2,3,4-trihydroxyphenylazo 5'-sulfonaphthalene

## 2,3,4-TRİHİDROKSİFENİLAZO 5'-SULFONAFTALİN REAGENTİ İLƏ PALLADİUM (II) İONUNUN SPEKTROFOTOMETRİK TƏYİNİ

**Esmira Həşimova**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti, “Kimya və qeyri-üzvi maddələrin texnologiyası” kafedrasının böyük laborantı, dissertant, https://orcid.org/0000-0002-2668-4274, Email: esmira.hashimova@mail.ru

XÜLASƏ

Piroqallol əsasında sintez edilən azobirləşmələrin palladium(II) ionu ilə qarşılıqlı təsiri zamanı mühitin turşuluğundan asılı olaraq rəngli kompleks birləşmələr əmələ gətirir. Bunu nəzərə alaraq palladium (II) ionunun spektrofotometrik təyini zamanı onun rolunu müəyyən etmək üçün onların əmələ gətirdikləri binar və müxtəlif liqandlı kompleks birləşmələr fotometrik metodla tədqiq edilmişdir. Komplekslərin spektrofotometrik xarakteristikaları hesablanmışdır. Belə ki, işıqudma spektrlərinə əsasən kompleks əmələgəlmənin optimal şəraiti müəyyənləşdirilmiş, temperaturun, vaxtın, reaktivin və üçüncü komponentin qatılığının kompleksəmələgəlməyə təsiri öyrənilmişdir. Müəyyən olunmuşdur ki. müxtəlifliqandlı komplekslərin spektrofotometrik göstəriciləri eyniliqandlı komplekslərlə müqaysədə daha çoxdur. Müxtəlifliqandlı kompleksin optimal şəraiti pH-2($PdR_1$ – SPCl) və pH-3-ə ($PdR_1$ – SPBr) bərabər olmuşdur. Əmələ gələn kompleks birləşmənin maksimum işıqudması 425 nm-də müşahidə olunur. pH 4-də reaktivin maksimum işıqudması isə 387 nm-dir. $R_1$ reagenti ilə palladiumun(II**)** kompleksəmələgəlmə reaksiyasına səthi aktiv maddələrlə təsir göstərdikdə reaksiyalarının analitik parametrləri kəskin artması müşahidə olunmuşdur. Həssaslıq, seçicilik əhəmiyyətli dərəcədə artır və demək olar ki, Ber qanununa tabeçilik intervalının aşağı sərhəddi kifayət qədər azalır.Üçlü komplekslərin davamlığı ikili kompleksə nisbətən daha yüksək olur. Məlum olmuşdur ki, üçüncü komponentlərin təsiri ilə müxtəlifliqandlı sistemin seçiciliyi binar kompleksə nəzərən yüksəkdir.
**Açar sözlər:** piraqallol, SPBr-setilpiridinxlorid, SPCl-setilpiridinbromid, 2,3,4-trihidroksifenilazo 5'-sulfonaftalin


ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

**Giriş**

Məlumdur ki, kompleksəmələgətirici sorbentlərdə sorbsiya prosesi əsasən nəcib metal ionlarının funksional qruplarla kompleks əmələgətirməsilə yaranır. Palladium ionu digər metallardan fərqli olaraq turş mühitdə tərkibində azot və kükürd saxlayan liqandlarla daha davamlı kompleks əmələgətirmək xassəsinə malikdir. Bu məqsədlə piroqallol əsasında sintez olunmuş reagentlərin iştirakı və polimer sorbenlərlə palladium (II) ionunun əmələ gətirdiyi kompleks birləşmələrin spektorofotometrik təyinatı aparılmışdır.

Demək olar ki, palladium(II) ionunun təyini zamanı bu və ya digər analitik göstəriciləri yüksək olan nəticələrin alınması əsasən hidroksiazobirləşmələrin (-OH, -N=N-) istifadəsi ilə mümkün olmuşdur. Bunları nəzərə alaraq göstərilən funksional qruplar saxlayan reagentlərdən istifadə– piroqallolun azotörəmələrinin palladium (II) ionu ilə səthi aktiv maddələr və hidrofob aminlər iştirakında kompleks əmələgətirməsinin sorbsion xassələrinin öyrənilməsi və analitik tətbiqi əsas məsələlərdəndir.

**Məqsəd**

**Problemin aktuallığı və əlaqəli tədqiqatlar.** Bu işdə əsas məqsəd instrumental tədqiqat metodlarından istifadə etməklə sintez edilmiş 2,3,4-trihidroksifenilazo 5'-sulfonaftalin reagenti ilə palladium (II) ionunun spektrofotometrik təyinidir. Palladium(II) ionunun sintez edilmiş piroqallol əsaslı üzvi reagentlərlə əmələ gətirdiyi kompleks birləşmələrin analitik göstəricilərinə kation tipli səthi aktiv maddələrin təsirinin təyini, palladium(II) ionlarının sorbsiya proseslərinin tədqiqatı əsas məsələlərdən biridir. Palladiumun (II**)** kompleksəmələgəlmə reaksiyasına səthi aktiv maddələrlə təsir göstərdikdə reaksiyalarının analitik parametrlərinin kəskin dəyişməsi müəyyən olunur. Tədqiqatı aparmaq üçün istifadə olunan cihaz və məhlullar aşağıda göstərilmişdir:

$PdCl_2$ (k.t.) duzundan 1000 mq/1 qatılıqlı Pd(II) ionunun məhlulu hazırlanmış və qatılığı standartlarla müqayisə edilərək dəqiqləşdirilmişdir. Pd(II) ionunun məhlulda tarazlıq qatılığı identifikasiya edilmiş piroqallol əsaslı 2,3,4-trihidroksifenilazo 5'-sulfonaftalin reaktivi ilə spektrofotometrik metodla təyin edilmişdir . Məhlulda ion qüvvəsinin lazımi qiymətini yaratmaq üçün KCl (k.t.) duzu məhlulundan istifadə edilmişdir. Mühitin pH-nı sabit saxlamaq üçün ammonium-asetat bufer məhlulundan (pH 3-11) və HCl fıksanalından (pH 0-2) istifadə edilmişdir. KOH məhlulu KOH-in hesablanmış kütləsinin bidistillə suyunda həll edilməsi ilə hazırlanmış və standart HCl məhlulu ilə titrlənərək qatılığı dəqiqləşdirilmişdir. Məhlulların optiki sıxlıqları KFK-2 fotokalorimetrində ölçülmüşdür. Məhlullann pH-na pHS-25 markalı şüşə elektrodlu ionomer vasitəsilə nəzarət edilmişdir. "Varian 3600 FI- IR" -də sorbentin İQ-spektri öyrənilmişdir. [1]

**Metodlar**

Palladium (II) ionunun piroqallol əsasında sintez edilən 2,3,4-trihidroksifenilazo $5^{/}$ sulfonaftalin ($R_1$) reaktivi ilə mühitin turşuluğundan asılı olaraq rəngli birləşmələr əmələ gətirir. Bunu nəzərə alaraq palladium (II) ionunun spektrofotometrik təyini zamanı onun rolunu müəyyən etmək üçün onların əmələ gətirdikləri binar və müxtəlif liqandlı kompleks birləşmələr fotometrik metodla tədqiq edilmişdir. Komplekslərin spektrofotometrik xarakteristikaları hesablanmışdır.[1,2] Belə ki, işıqudma spektrlərinə əsasən kompleks əmələgəlmənin optimal şəraiti müəyyənləşdirilmiş, temperaturun, vaxtın, reaktivin və üçüncü komponentin qatılığının kompleksəmələgəlməyə təsiri öyrənilmişdir. Geniş dalğa uzunluğunda (λ=200-700 nm) rəngli komplekslərin əmələ gəlməsinin optimal şəraitini müəyyən etmək məqsədilə onların udma spektrləri müəyyən

ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 23 ISSUE 12 2022

olunmuşdur. Bu zaman təcrübə üçün tutumu 25 ml olan ölçü kolbasına 1,0 ml $1,0 \cdot 10^{-3}$ M Pd(II) məhlulu və 2,0 ml $1,0 \cdot 10^{-3}$ M reaktiv məhlulu tökülmüş və müxtəlif turşuluqlu (pH=1,0-14) bufer məhlulu cizgiyə qədər əlavə edilərək məhlul durulaşdırılmışdır. Alınmış rəngli məhlulların optiki sıxlıqları reaktiv fonunda, *l*=1,0 sm qalınlıqlı küvetdən istifadə etməklə "Lambda-40" spektrofotometrində ölçülmüşdür. [2-3]

$R_1$ reagenti ilə palladium (II) ionunun qarşılıqlı təsiri zamanı əmələ gələn kompleks birləşmənin optimal şəraitini müəyyən etmək üçün pH-ın 1-7 intervalında kompleksin işıqudma spektrləri çəkilmişdir. $R_1$ reagenti ilə palladiumun (II) əmələ gətirdiyi kompleks birləşmənin maksimum dalğa uzunluğunda pH-dan asılı olaraq optiki sıxlığının dəyişməsi şəkil 1-də verilmişdir.[4-5]

Yeni sintez olunmuş reaktivin müxtəlif növ üçüncü komponentlər ( ikinci liqandlar) iştirakında bəzi metal ionları ilə müxtəlifliqandlı komplekslərinin əmələgəlmə qanunauyğunluqlarının müəyyən edilməsi onların kimyəvi-analitik xarakteristikalarının metal ionu , reaktiv və üçüncü komponentin təbiətindən və liqandlararası qarşılıqlı təsirdən asılılığı müəyyən olunmuşdur. Reaktivlərin mühitin turşuluğundan asılı olaraq məhluldakı formaları tədqiq edilmişdir. Bu zaman onların molekulyar formalarının kompleks əmələgəlmə reaksiyaları üçün daha da mühüm əhəmiyyət kəsb etdiyi göstərilmişdir.




**Şəkil 1.** Palladium (II) SAM iştirakında və iştirakı olmadan əmələ gələn komplekslərinin optiki sıxlığının məhlulun pH-dan asılılığı: 1- $PdR_1$; 2- $PdR_1$-SPCl; 3- $PdR_1$-SPBr

Optimal pH-da kompleks birləşmənin işıqudma spektri çıxarılmışdır. Şəkillərdən də göründüyü kimi binar kompleksin optimal pH-ı 3-ə, müxtəlifliqandlı kompleksin optimal şəraiti pH-2 ($PdR_1$ – SPCl) və pH-3-ə ($PdR_1$ – SPBr) bərabər olmuşdur. (Şəkil 2.)

E-ISSN: 2674-5224
VOLUME 23 ISSUE 12 2022







**Şəkil 2.** $R_1$ və onun palladium (II) SAM iştirakında və iştirakı olmadan əmələ gətirdiyi komplekslərinin işıqudma spektrləri : 1-$R_1$, 2- $R_1$-SPCl, 3- $R_1$-SPCl-Pd, 4- $R_1$- SPBr, 5- $R_1$- SPBr-Pd

Əmələ gələn kompleks birləşmənin maksimum işıqudması 425 nm-də müşahidə olunur. pH 4-də reaktivin maksimum işıqudması isə 387 nm-dir.

Kompleksəmələgəlməyə reaktivin qatılığının təsiri öyrənilmişdir.Təcrübə nəticəsində müəyyən olunmuşdur ki, $1{,}0\cdot10^{-4}$ M $R_1$ reaktivi ilə $1\cdot10^{-3}$ M palladium(II) ionunu kompleksin tərkibinə tam keçirmək mümkündür. $R_1$ reagenti ilə palladiumun (II) əmələ gətirdiyi kompleks birləşməyə setilpiridinxlorid, setilpiridin bromidin təsiri zamanı əmələgələn müxtəlifliqandlı kompleks birləşmə öyrənilmişdir. Müxtəlif dalğa uzunluqlarında pH-dan asılı olaraq əmələ gələn müxtəlifliqandlı kompleks birləşmələrin işıqudma spektrləri çəkilmişdir. (şəkil 2.) [6]

Optimal pH-da müxtəlifliqandlı kompleks birləşmələrin işıqudma spektrləri və maksimum dalğa uzunluğunda optiki sıxlığın pH-dan asılılığı öyrənilmişdir (şəkil 3). Təcrübələrə əsasən müəyyən edilmişdir ki, bu komplekslərin maksimal çıxımı pH-3 (PdR1-SPBr), pH-2 (Pd$R_1$-SPCl) Pd$R_1$-SPBr və Pd$R_1$-SPCl komplekslərinin maksimum işıqudması uyğun olaraq 450, 460 nm-dir.

Kompleksəmələgəlməyə optimal şəraitdə reaktivin və üçüncü komponentlərin qatılığının təsiri öyrənilmişdir.Tam kompleksəmələgəlməyə Pd$R_1$-SPBr, Pd$R_1$-SPCl sistemi üçün uyğun olaraq $1\cdot10^{-4}$ M $R_1$ (Pd$R_1$-SPCl) və $1{,}0\cdot10^{-4}$ M $R_1$ (Pd$R_1$- SPBr), $3{,}2\cdot10^{-4}$ M SPCl, $4\cdot10^{-4}$ M SPBr tələb olunur.[7-8]

$R_1$ reagentilə palladiumun (II) əmələ gətirdiyi binar və müxtəlifliqandlı kompleks birləşmələrin optiki sıxlıqlarının zamandan və temperaturdan asılılığı öyrənilmişdir. Binar və müxtəlifliqandlı komplekslər reaksiya məhsullarını qarışdırdıqdan sonra həmin an əmələ gəlir.Müəyən olunmuşdur ki, üçlü komplekslərin davamlığı ikili kompleksə nisbətən daha yüksəkdir.[9]

Palladium(II) ionunun təklif olunan reaktivlərlə əmələ gətirdiyi binar komplekslərin tərkibi əsasən izomolyar seriyalar, Starik-Barbanelin nisbi çıxımı, tarazlığın yerdəyişməsi metodları ilə təyin olunmuşdur. Müxtəlifliqandlı kompleks birləşmələrin tərkibi isə Starik-Barbanelin nisbi çıxım və tarazlığın yerdəyişməsi metodları ilə təyin olunmuşdur.[10-11]

Palladium(II) ionun tədqiq olunan binar və müxtəlif liqandlı kompleks birləşmələrinin spektrofotometrik xarkteristikaları cədvəl1-də verilmişdir:[12]

**Cədvəl 1.** Palladium(II) ionun tədqiq olunan binar və müxtəlif liqandlı kompleks birləşmələrinin spektrofotometrik xarakteristikaları.

| Kompleks | pH | $\lambda_{max}$ nm | $\varepsilon_{MeR}\times10^{-4}$ | M:R:X | $lgK_1$ | Ber qanununa tabeçilik intervalı, mkq/ml |
|---|---|---|---|---|---|---|
| $PdR_1$ | 3 | 425 | 1,73±0,02 | 1:2 | 4,90±0,02 | 0,19,-5,06 |
| $PdR_1$-SPCl | 2 | 450 | 1,11±0,02 | 1:2:2 | 8,95±0,02 | 0,41-3,98 |
| $PdR_1$-SPBr | 3 | 460 | 2,31±0,01 | 1:2:2 | 9,10±0,04 | 0,4-4,19 |

Cədvəldən 1-dən göründüyü kimi $PdR_1$-SPCl, $PdR_1$- SPBr, kompleks birləşmələrinin optimal əmələgəlmə şəraiti o biri komplekslərə nisbətən daha turş mühitdə təsadüf edir.
Eyniliqandlı və müxtəlifliqandlı komplekslərin tərkibi izomolyar seriyalar, Starik-barbanel və tarazlığın yerdəyişməsi metodu ilə təyin edilmişdir.İşlənmiş metodika nəticəsində müəyyən olunmuşdur ki, kimyəvi quruluşlarına görə bir-birinə yaxın olan reaktivlərin palladium (II) ionu ilə əmələ gətirdikləri kompleks birləşmələrin tərkibi 1:2-dir.

**Nəticə**

- $PdR_1$-SPCl, $PdR_1$- SPBr kompleks birləşmələrinin optimal əmələgəlmə şəraiti o biri komplekslərə nisbətən daha turş mühitə təsadüf edir. Bu zaman binar kompleksə nəzərən $R_1$ reagentinin modifikasiya olunmuş formalarının palladium (II) ionu ilə əmələ gətirdiyi komplekslərin əmələ gəlməsinin optimal şəraiti turş mühitdə müşahidə olunur.
- İşıqudma spektrlərinə əsasən kompleks əmələgəlmənin optimal şəraiti müəyyənləşdirilmiş, temperaturun, vaxtın, reaktivin və üçüncü komponentin qatılığının kompleksəmələgəlməyə təsiri öyrənilmişdir.
- $R_1$ reagenti ilə palladiumun(II) kompleksəmələgəlmə reaksiyasına səthi aktiv maddələrlə təsir göstərdikdə reaksiyalarının analitik parametrləri kəskin artması müşahidə olunmuşdur.
- Həssaslıq, seçicilik əhəmiyyətli dərəcədə artır və deməк olar ki, Ber qanununa tabeçilik intervalının aşağı sərhəddi kifayət qədər azalır.
- Məlum olmuşdur ki, üçüncü komponentlərin təsiri ilə müxtəlifliqandlı sistemin seçiciliyi binar kompleksə nəzərən yüksəkdir.
- Üçlü komplekslərin davamlığı ikili kompleksə nisbətən daha yüksəkdir.

**ƏDƏBİYYAT**

1. Abilova,U.M., Hashimova, E.N., Gadjieva, S.R., Chiragov, F.M. Spectrophotometric sorption of palladium(II) ions with maleic anhydride styrene copolymer-norsulfazolum system// Advanced in synthesis and complexing Book of abstracts The fifth international scientific conference, -Moscow, RUDN University, -22-26 April,-2019,- s.85





2. Aparnev, A.I., Kazakova, A.A., Aleksandrova, T.P. Analiticheskaya ximiya I fiziko-ximicheskiye metodi analiza / Aparnev, A.I., Kazakova, A.A., Aleksandrova, T.P.- Izd.-vo NQTU, -Novosibirsk, 2018.-139 s.
3. Didux-Shadrina, S.L., Primenenie kremnezema s immobilizovanniy 2-nitorozo-1naftol-4-sulfokislotoy dlya sorbsionno – fotometricheskoqo opredeleniya palladiya / S.L.Didux-Shadrina, V.N.Losev, N.V.Maznyak,A.K.Trofimchuk // Jurnal analiticheskoy ximii.-2019, -T. 74, -№ 8, -str.. 574-579
4. Dubrovina,V.A. Spektrofotometricheskoe opredelenie palladiya v promishlennix obiektax s predvaritelnim izvlecheniem vodorastvorimim ekstragentami //statiya v sbornike trudov konferenchii, sovremennaya nauka:idei, kotorie izmenyaet mir.- Bryansk, 22–23 ноября, 2018, st.189-194.
5. Hassan, N., A. Amin, S. "Solid phase extraction and spectrophotometric determination of palladium with 1-(2-benzothiazolylazo)-2-hydroxy-3-naphthoic acid," Analytical Chemistry Letters.- 2017, vol. 7, no. 5.pp. 724–736,
6. Kuliev , K.A.,Verdizade N.A. Spektrofotometricheskoe opredelenie tyajelix metallov v pochvax //Zavodskaya laboratoriya Materialov. -2019. -T. 85, -№ 5. s.18-27.
7. Qribov, L.A. Analiticheskaya ximiya, v 3-x tomax. Tom 3. Instrumentalnie metodi analiza / L.A. Qribov, A.A.Ishenko- chasti 2.-2020,-505 s.
8. Losev, V. N. Sorption-spectrometric determination of palladium and gold using silica chemically modified with dipropyl disulfide groups/ V. N. Losev, E. Borodina, O.V. Buiko, N.V. Maznyak // Journal of Analytical Chemistry.- 2014,-may -69(5),- -p.413-419
9. Lozynska, L.V., Tymoshuk,O.S., Chaban, T.I. "5-Hydroxyimino-4-imino-1,3-thiazolidin-2-one as a new analytical reagent for the spectrofotometric determination of Pd(II)," Methods and Objects of Chemical Analysis.- 2014, vol. 9, no. 1, pp. 50–54,
10. Saranchina, N.V. Qavrilenko N.A. Tverdofazno-spektrofotometricheskoe opredelenie palladiya (II) s ispolzovaniem 1-(2-piridilazo)-2 naftola, immobilizovannoqo v polimetakrilatnuyu matrichu// -Izvestiya Tomskoqo politexnicheskoqo universiteta.-2012. -T. 321. -№ 3, -s.96-100
11. Tymoshuk, O.S., Fedyshyn , O.S., Oleksiv,L.V., Rydchuk,P.V., Vasyl S. Matiychuk, V.S. Spectrophotometric Determination of Palladium(II) Ions Using a New Reagent: 4-(N'-(4-Imino-2-oxo-thiazolidine-5-ylidene)-hydrazino)-benzoic Acid (p-ITYBA)/-Hindawi Journal of Chemistry.- 2020,- p.8
12. Volchkova ,E.V., Boryagina, I.V., Buslaeva, T.M., Ablichov, A.A., Bondar, N.M., Erlix, Q.V. Sorbsiya palladiya (II) is azotkislix rastvorov kremnezemom, modifichirivonannim aminoqruppami// -Izvestiya vuzov. Chvetnaya metallurgiya.- Moskva, 2016, №3, s.12-19.


ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

E-ISSN: 2674-5224

VOLUME 23 ISSUE 12 2022

# СПЕКТРОФОТОМЕТРИЧЕСКОЕ ОПРЕДЕЛЕНИЕ ИОНА ПАЛЛАДИЯ (II) С 2,3,4-ТРИГИДРОКСФЕНИЛАЗО-5'-СУЛЬФОНАФТАЛИНОВЫМ РЕАГЕНТОМ

**Эсмира Гашимова**
Азербайджанский государственный университет нефти и промышленности, старший лаборант кафедры «Химии и технологии неорганических веществ» , диссертант, https://orcid.org/0000-0002-2668-4274,
Email: esmira.hashimova@mail.ru

**РЕЗЮМЕ**

При взаимодействии азосоединений, синтезированных на основе пирогаллола с ионом палладия (II) образуются окрашенные комплексные соединения в зависимости от кислотности среды. Учитывая это, для определения его роли при спектрофотометрическом определении иона палладия (II) фотометрическим методом исследовали образуемые ими бинарные и комплексные соединения с различными лигандами. Рассчитаны спектрофотометрические характеристики комплексов. Таким образом, по спектрам света были определены оптимальные условия комплексообразования, изучено влияние температуры, времени, концентрации реагента и третьего компонента на комплексообразование. Было определено, что спектрофотометрические показатели комплексов с разными лигандами больше по сравнению с комплексами с тем же лигандом. Оптимальные условия полилигандного комплекса были равны pH-2 (PdR1 – SPCl) и pH-3 (PdR1 – SPBr). Максимальное свечение обработанного комплекса наблюдается при 425 нм. При pH 4 максимальная освещенность реагента составляет 387 нм. При влиянии поверхностно-активных веществ на реакцию комплексообразования палладия (II) с реагентом $R_1$ аналитические параметры реакций резко возрастают. Чувствительность и селективность значительно возрастают, и можно сказать, что нижняя граница интервала подчинения закону Бера достаточно снижается.Стойкость тройных комплексов выше, чем бинарных. Установлено, что селективность полилигандной системы за счет влияния третьих компонентов выше, чем у бинарного комплекса.

**Ключевые слова:** пирагаллол, SPBr-цетилпиридинхлорид, SPCl-цетилпиридинбромид, 2,3,4-тригидроксифенилазо 5'-сульфонафталин.

Publication history

Article received: 14.11.2022
Article accepted: 28.11.2022
Article published online: 19.12.2022
DOI suffix: 10.36962/PAHTEI23122022-13

применения химических реагентов без необходимости больших капитальных вложений является одной из основных задач на будущее. С этой целью из скв. 28 мая поле SOCAR. изучали на пробе масла. Новая нанокомпозиция из применяемых ПАВ оказалась более эффективной против температуры замерзания образца высокопарафиновой нефти, ее обезвоживания и асфальтено-смолапарафинового осаждения. Таким образом, композиция наночастиц и ПАВ снижает температуру замерзания масла с +15°C до -2°C для реагента Дифрон-3970+Cu и -8°C для реагента НД-НДП-1+Cu. . При этом отдельные реагенты по деэмульгирующей способности, реагенты Дифрон-3970 и НД-НДП-1, обезвоживают 60% нефти на 15% и 4% соответственно, а нанокомпозиты обезвоживают на 10% и 2%.

Впервые в лабораторных условиях изучено влияние новой композиции на отложение асфальтосмоло-парафиновых отложений на металлической поверхности методом «Холодная трубка», основанным на добавлении наночастиц меди в Дифрон-3970 и Реагенты НД-НДП-1. Опыты проводились в «Холодной трубе» при температуре 200С в различных концентрациях депрессорных добавок (100-700 г/т). По результатам, полученным в ходе экспериментов, рассчитывали эффективность состава, приготовленного с добавлением индивидуальных реагентов и наночастиц, и при этом максимальный процент парафиновых отложений, собирающихся на поверхности пробирки. Наибольшая эффективность 99% наблюдалась при концентрации 700 г/т депрессорной добавки «НД-НДП-1+Cu».

**Ключевые слова:** наночастица, композиция, охлаждающая трубка, высокопарафиновое масло, деэмульгирование, температура замерзания.

Publication history

Article received: 15.11.2022
Article accepted: 29.11.2022
Article published online: 19.12.2022
DOI suffix: 10.36962/PAHTEI23122022-42



ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

# TECHNOLOGY OF WIRELESS INFORMATION TRANSMISSION IN WELLS USED BY DEEP PUMPS

**Javida Damirova[1], Eshgin Babayev[2]**
[1,2]Azerbaijan State Oil and Industry University, [1,2]Department of Electronics and automation.
[1]PhD https://orcid.org/0000-0003-4142-8014, Email: cavida.damirova@asoiu.edu.az
[2]Master, https://orcid.org/ 0000-0002-4217-408X, Email: esqinbaba99@gmail.com

## ABSTRACT

Today, most of the offshore and onshore oil wells are wells that are operated with rod-type submersible pumps. In the CIS countries, the method of deep well pumps used for oil extraction makes up 66% of the total methods.

The reason for this is that the equipment of these pumps is structurally simple. Through these pumps, up to 500 m3 of oil is brought to the surface every day. It is necessary to measure some parameters at the bottom of the well. Especially temperature and pressure measurement.

However, in the process of producing oil, technological conditions and conditions in the reservoir and well are constantly changing. Continuous information from the reservoir and the well is required to control the operation of the equipment and make operational decisions. The received information allows us to organize economically profitable oil production, choose the right technology and equipment for extracting oil from the well. It is not an easy task to measure well parameters, to process, collect and transmit information before opening the wellhead and requires complex engineering, mathematical and logistical knowledge. Because the cables of the sensors sent to the bottom to receive information from the bottom of the well often cause problems.

Thus, when it is sent down, it causes jams, and when it is taken out, it causes breakage. Also, taking into account that these malfunctions can also occur in the work process. The replacement of cables depends on the replacement time of other equipment. This may take several years.

Collection tasks and initial processing of information are solved quite effectively with the help of modern information tools. However, by establishing wireless communication, we can overcome this problem. We will use a special communication line for this.

The communication line is the most important element designed to transmit data from the transmitter to the receiver through a signal. Technological fluids, electric cables, acoustic pulses in pipe metal, hydraulic, electrical conductors and electromagnetic vibrations produced by them, radio channel and electromagnetic communication channels are used as materials to build a communication channel. Various combinations of the above methods can also be constructed.

The communication channel consists of a set of technical means designed to send information from the source, that is, from the bottom of the well, to the receiver, that is, to the wellhead ("bottom"-"wellhead").

This method is also economically beneficial. Because existing local devices are used to establish the communication channel.

In this way, we achieve the main goal, i.e. reliable and uninterrupted delivery of information from the bottom of the well to the mouth of the well.

The problem of information transmission at the wellhead is relevant and interesting for scientific and practical activities.

**Keywords:** Rod depth pumps, oil wells, wireless communication, communication channel, galvanic communication channel.

## DƏRINLİK NASOSLARI İLƏ İSTİSMAR OLUNAN QUYULARDA SİMSİZ İNFORMASİYA ÖTÜRMƏ TEXNOLOGİYASI

**Cavidə Dəmirova[1], Eşqin Babayev[2]**
[1,2]Azərbaycan Dövlət Neft və Sənaye Universiteti, [1,2] "Elektronika və avtomatika" kafedrası
[1]T.ü.f.d., dosent, https://orcid.org/0000-0003-4142-8014; Email: cavida.damirova@asoiu.edu.az
[2]Magistr, https://orcid.org/ 0000-0002-4217-408X; Email: esqinbaba99@gmail.com

### XÜLASƏ

Günümüzdə dənizdə və quruda neft çıxarılan quyuların əksəriyyəti ştanqlı dərinlik nasosları ilə istismar olunan quyulardır. MDB ölkələrində neft çıxarma üçün istifadə olunan ştanqlı dərinlik nasosları üsulu ümumi üsulların 66%-ni təşkil edir.
Buna səbəb bu nasosların avadanlığının konstruktiv cəhətdən sadə olmasıdır. Bu nasoslar vasitəsilə hər gün 500 $m^3$ - ə qədər neft yer üzünə çıxardılır. Quyu dibində bəzi parametlərin ölçülməsi lazım gəlir. Xüsusəndə temperatur və təzyiqin ölçülməsi.
Lakin, neft hasil olunan prosesdə daimi olaraq lay və quyuda texnoloji şərtlər və vəziyyət dəyişir. Avadanlıqların işini idarə etmək və operativ qərarlar qəbul etmək üçün laydan və quyudan fasiləsiz məlumat almaq tələb olunur. Alınan bu informasiya bizə imkan verir ki, iqtisadi cəhətdən sərfəli neft hasilatını təşkil edək, düzgün texnologiyanı və quyudan nefti çıxarmaq üçün avadanlığı seçək. Heç də quyu parametrlərini ölçmək, quyu ağzı açılmadan informasiyanı işləmək, toplamaq, ötürmək asan məsələ deyil və mürəkkəb mühəndislik, riyazi və logistik biliklər tələb edir. Çünki quyu dibindən informasiyanın alınması üçün dibə göndərilən sensorların kabelleri tez-tez problemlər çıxardır.
Beləliklə, ya aşağıya göndərilən zaman ilişmələrə, yuxarı çıxardılan zaman qırılmalara səbəb olur. Həm də nəzərə alsaq ki, bu nasazlıqlar iş prosesində də baş verə bilər. Kabellərin dəyişməsi isə digər avadanlıqların dəyişmə müddətindən aslıdır. Bu da ki, bir neçə il çəkə bilər.
Toplama vəzifələri və informasiyanın ilkin emalı müasir informasiya vasitələrinin köməyi ilə kifayət qədər effektiv həll olunur. Belə ki, simsiz rabitə qurmaqla biz bu problemi aradan götürə bilərik. Bunun üçün xususi rabitə xəttindən istifadə edəcəyik.
Rabitə xətti məlumatları siqnal vasitəsilə ötürücüdən qəbulediciyə ötürmək üçün nəzərdə tutulmuş ən mühüm elementidir. Rabitə kanalı qurmaq üçün material kimi texnoloji mayelər, elektrik kabelləri, boru metalında akustik impulslar, müvafiq olaraq hidravlik, elektrik keçiricilərdən və bunların əmələ gətirdiyi elektromaqnit vibrasiyaları, radio kanalı və elektromaqnit rabitə kanallarından istifadə olunur. Həmçinin yuxardakı metodların müxtəlif kombinasiyalarını da qurmaq olar.
Rabitə kanalı informasiyanın mənbədən yəni, quyu dibindən alıcıya yəni, quyu ağzına ("dib"-"quyu ağzı") göndərmək üçün nəzərdə tutulmuş texniki vasitələr toplusundan ibarətdir.


ISSN: 1609-1620, E-ISSN: 2674-5224
P A H T E I
REFEREED & REVIEWED JOURNAL

Bu üsul iqtasidi cəhətdən də sərfəlidir. Çünki rabitə kanalına qurmaq üçün mövcud yerli cihazlardan istifadə olunur.
Bununla da əsas məqsədə, yəni, quyu dibindən informasiyanın quyu ağzına etibarlı və kəsilməz formada çatdırılmasına nail oluruq.
Quyu ağzına məlumat ötürülməsi problemi elmi və praktiki fəaliyyət üçün aktual və maraq kəsb edir.
**Açar sözlər:** Ştanqlı dərinlik nasosları, neft quyuları, simsiz rabitə, rabitə kanalı, qalvanik rabitə kanalı.

## Giriş

Neft-qaz sənayesində geofiziki inkişaf dedikdə kabel əlaqəsindən stasionar quyuların monitorinq sisteminə keçiriməsi anlaşılır. Bu sistemlərdə geofiziki tədqiqatların əsas funksiyalarını həyata keçirmək üçün uzaqdan-avtonom rejimdə işləyən quyu sensorlarından istifadə olunur. Kabeldən istifadə edərəkən tədqiqat üsulları əhəmiyyətli məhdudiyyətlərə məruz qalırdı.
Buna görə də quyu parametrlərinin səthə çatdırılması üçün yeni avadanlıq və texnologiyaların hazırlanmasına və qurulmasına ehtiyac var .
Quyu dibindən məlumatın quyu ağzına ötürülməsinin bütün mövcud metodları ilk növbədə qazma quyularının öyrənilməsi üçün ixtira edilmişdir. Həmin bu rabitə kanalları əsasən qazma quyularının xassələri haqqında məlumat almaq üçün nəzərdə tutulub. Bu üsullar daha sonralar mövcud hasilat və suvurma quyularını tədqiq etmək üçün dəyişdirildi. Amma istismar quyularında bəzi elə xüsusiyyətlər var ki, onlar qazma üçün ənənəvi rabitə kanallarından isifadə etməyi çətinləşdirir. Həmin bu məhdudiyyəti yaradan xüsusiyyətlərdən biri də geofiziki alətlərin enməsi üçün lazım olan boş yerin olmamasıdır. Bəzi quyular yüksək quyu meyl bucağına malik olur ki, bu da böyük fəsadlara gətirib çıxardır. Avadanlığın həlqəvi boşluqda tez-tez baş verən ilişməsi, giriş kabelinin və ya xüsusi naqilin qırılmasına səbəb olur. Belə ilişmiş aləti yalnız yeraltı quyu təmiri briqadasının köməyi ilə çıxarmaq olar. Ənənəvi qazma rabitə kanallarının istifadəsini çətinləşdirən digər səbəb, cihazın quyuya yerləşdirilməsi və lazım olan vaxta çıxarılması arasındakı uzun müddətdir. Biz ölçü cihazını yoxlamaq və ya təmir etmək üçün nasos avadanlığının əsaslı təmirini gözləməliyik və orta hesabla bu müddət bir ildən bir neçə ilə qədər dəyişir [1-4]. Kommunikasiya kanalı bütün bu müddət ərzində işləməlidir, əgər bu kanallar quyu üstü batareyalardan enerji alırsa, bunu reallaşdırmaq olduqca çətindir.

## Məqsəd

Bu problemlərin həlli üçün kabelsiz rabitə kanallarından, o cümlədən birləşdirilmiş kanallardan istifadə olunur. Yerli və xarici mənbələrdə mövcud olan və təklif edilən məlumat ötürmə üsullarının analizi göstərir ki, onların etibarlılığı, səs-küyə qarşı toxunulmazlığı, sürəti, hər iki tərəfə əlaqənin mümkünlüyü əsasən siqnalın göndərildiyi mühitin xüsusiyyətlərindən asılı olur. Ötürücü mühitinin xassələri çox vaxt öyrənilmir, çünki, onlar zaman və məkanda dəyişir, temperatur və təzyiqdən güclü şəkildə asılı olurlar. Bunun üçün də, texniki xüsusiyyətlərinə görə kabelli kanallara bənzəyən etibarlı və yüksək səmərəli rabitə kanalı əldə etmək üçün transmissiya mühiti kimi sabit və qabaqcadan bizə məlum keçirici xüsusiyyətləri olan materiallardan istifadə etmək lazım gəlir [5-8]. Bundan

əlavə neft hasilatı metodu və quyunun müvafiq texniki və texnoloji avadanlığı nəzərə alınmalıdır.
Tədqiqatın əsas məqsədi ştanqlı dərinlik nasosları ilə işləyən quyularda məlumatın dibdən quyu ağzına naqilsizötürülməsi texnologiyasını hazırlamaqdır.

## Metodlar

Tədqiqat obyektləri ştanqlı dərinlik nasos qurğuları (ŞDNQ) ilə təchiz olunmuş neft quyularıdır. Belə quyularınəsas xüsusiyyəti, mayeni bir pistonlu (porşenli) nasosdan istifadə edərək səthə çıxarmaqdır. 3000 m-ə qədər dərinlikdə yerləşən nasos qurğusu səthdə yerləşən intiqal və intiqalın hərəkətini mancanaq avadanlığı vasitəsilə qəbul edən ştanqlar ilə idarə edilir. Nasos qurğusu mürəkkəb sistem təşkil edən yerüstü və yeraltı avadanlıqlardan ibarətdir, onun əsas hissəsi borulardan, sorucu ştanqlar silsiləsi (SŞS) və sorucu nasosdan (SN) ibarətdir.
Məlumatın quyu dibindən ŞDNQ ilə təchiz olunmuş quyu ağzına göndərilməsi texnologiyasının inkişafı mürəkkəb, lakin çox gərəkli texniki və texnoloji vəzifədir, çünki MDB ölkələrində neft çıxarma üçün istifadə olunan ştanqlı dərinlik nasosları üsulu ümumi üsulların 66%-ni təşkil edir.
Rabitə kanalı informasiyanın mənbədən yəni, quyu dibindən alıcıya yəni, quyu ağzına ("dib"-"quyu ağzı") göndərmək üçün nəzərdə tutulmuş texniki vasitələr toplusundan ibarətdir. rabitə kanalının əsas komponentləri siqnal ötürücüsü, rabitə xətti və siqnal qəbuledicisindən ibarətdir. Həssas elementdən gələn ilkin impulsu müəyyən rabitə xətti ilə ötürmək üçün standart siqnal formasına salmaq lazım olur. Bunun üçün də transmitter istifadə olunur. Siqnal qəbuledicisi rabitə kanalı vasitəsilə gələn siqnalı qəbul edir və onu sonrakı emal mərhələləri üçün əlverişli formaya salır. Rabitə xətti məlumatları siqnal vasitəsilə ötürücüdən qəbulediciyə ötürmək üçün nəzərdə tutulmuş ən mühüm elementdir.




**Şəkil 1**. Telemetriya sistemlərinin rabitə kanalları

E-ISSN: 2674-5224
VOLUME 23 ISSUE 12 2022

ISSN: 1609-1620, E-ISSN: 2674-5224
P A H T E I
REFEREED & REVIEWED JOURNAL

Rabitə kanalı qurmaq üçün material kimi texnoloji mayelər, elektrik kabelləri, boru metalında akustik impulslar, müvafiq olaraq hidravlik, elektrik keçiricilərdən və bunların əmələ gətirdiyi elektromaqnit vibrasiyaları, radio kanalı və elektromaqnit rabitə kanallarından istifadə olunur (şəkil 1). Həmçinin yuxardakı metodların müxtəlif kombinasiyalarını da qurmaq olar.

**Tədqiqatın nəticələri və müzakirəsi**

Effektiv işləyən rabitə kanalı qurmaq üçün bir obyekt ştanqlı dərinlik nasosları təchiz edilmiş quyunun dizayn xüsusiyyətlərinin təhlili aşağıdakı nəticələrə gətirib çıxardır. Ştanqlı dərinlik nasos qurğusu ilə istismar olunan quyunun sxematik təsviri şəkil 2-də göstərilmişdir. Diaqrama baxaraq anlamaq olar ki, iki naqilli rabitə xəttinin əvəzinə elektrik keçirici materialdan hazırlanmış boru kəməri və ştanqlar vasitəsilə məlumatı quyu dibindən quyu ağzına göndərmək olar (şəkil 3).

Nəzəri hesablamalar və eksperimental tədqiqatlar göstərir ki, ştanqlı dərinlik nasos qurğuları ilə istismar olunan quyularda simsiz rabitə kanalının reallaşdırılması mümkündür. Elektromaqnit rabitə kanalı vasitəsilə informasiya göndərmək üçün bir metod, habelə onun reallaşdırılması üçün bir qurğu təklif edirik, burada rabitə xəttinin elementləri kimi ştanq və borudan istifadə etməyi təklif edirik. Bu rabitə kanalı vasitəsilə informasiyanın ötürülməsi sualtı moduldan, torpaq qurğusundan və boru kəmərindən və rabitə xətti kimi istifadə edilən ştanq simindən ibarət cihazdan istifadə etməklə reallaşdırılır.

Quyu parametrləri haqqında verilənlərin ötürülməsi üçün qalvanik rabitə kanalı ilə ŞDNQ monitorinq rabitə kanalının sxematik diaqramı şəkil 3-də göstərilmişdir. Sualtı modul quyu nasosunun suqəbuledicisinin birbaşa yaxınlığında yerləşir və akkumulyator ilə təchiz olunmuş elektron aqreqatdan, bundan əlavə temperatur və təzyiq sensorlarından, prosessorun emal bloklarının yerləşdiyi elektron lövhədən, verilənləri saxlamaq üçün yaddaşdan, yerüstü idarəetmədən və qalvanik rabitə kanalı vasitəsilə qurulmuş stansiyadan ibarətdir. Elektron blokun vəzifələrinə təzyiq və temperatur sensorlarının vasitəsilə ölçmə aparılması, ölçülən parametrlərin qiymətlərinin daxili yaddaşa yazılması və rabitə kanalı vasitəsilə simsiz məlumatın quyu ağzına ötürülməsi daxildir.

Sualtı modulda separatorun altında yerləşən, borunun yuxarı hissəsi ilə aşağı hissə arasında böyük müqavimət yaradan bir ayırıcı və müqaviməti kəskin şəkildə azalda bilən, yuxarı hissəni "bağlayan" açar var. Bu hissə borunun aşağı hissəsi sayılır.

Ötürdüyümüz məlumatdan və istifadə etdiyimiz kodlaşdırma metodundan aslı olaraq açarı bağlayıb və açmaq yolu ilə quyu ağzına məlumatın ötürülməsini reallaşdırırıq. Sualtı modul bizə imkan verir ki, yerüstü rabitə qurğusuna siqnal göndərək və növbəti mərhələdə siqnal demodulyasiya olunub ModbusRTU protokolu altında RS485 interfeysi vasitəsilə ŞDNQ-nin idarəetmə blokuna məlumat ötürülür ordan da həmçinin nəzarətçiyə ötürülür.

Ştanqlı dərinlik nasosları ilə istismar olunan quyularda simsiz qalvanik yolla məlumatın ötürülməsinin mümkünlüyünü əsaslandırmaq üçün nəzəri və eksperiment tədqiqatların nəticələrinə əsasən məlumatların göndərilməsi üçün həmin bu texnologiyanın pilot nümunəsinin ilkin parametrləri və xüsusiyyətləri cədvəli qurulmuşdur (cədvəl 1).




**Şəkil 2.** ŞDNQ ilə təchiz olunmuş quyunun sxematik təsviri: 1 – nasos; 2 - boru kəməri; 3 – quyu ştanqları; 4 – mancanaq qurğusu; 5 - reduktor; 6 - mühərrik

Cədvəldə quyu dibindən quyu ağzına qədər olan məsafədə temperatur və təzyiq parametrlərinin real vaxt rejimində qiymətləri göstərilmişdir. Yer bloku ilə sualtı modul kompleks şəkildə qoşulmalıdır. Mexaniki və iqlim təsirlərinə görə GOST 26116-84, sualtı modul isə MS 2-1, KS 4-2 qruplarına, yer bloku - MCI qrupuna, KS G-ə aid olmalıdır.

**Cədvəl 1:** İnformasiya kompleksinin əsas parametrləri və xüsusiyyətləri

| Ad | Ölçü | Qiymət |
|---|---|---|
| Təzyiq (ölçmə diapazonu) | MPa | 0-10 |
| Temperatur (ölçmə diapazonu) | °C | 5-45 |
| Mütləq temperaturun ölçmə xətası | % | ±0.5 |
| Üst həddən ayırd etmə (təzyiqlə) | MPa | 0.00002 |
| Qətnamə (temperatur ilə) | °C | 0.03 |
| Davamlı əməliyyat müddəti | gün | 500 |
| İşçi temperatur | °C | 45 |
| Hidrostatik təzyiq | MPa | 20 |




**Şəkil 3.** Qalvanik rabitə kanalı olan monitorinq stansiyası ilə ŞDN quyusu.

Quyu haqqında informasiyanı ötürmək üçün qalvanik rabitə kanalı olan sualtı modul quyudakı sorucu nasosun su qəbul etdiyi hissənin bilavasitə yaxınlığında yerləşir və akkumulyatorlarla təchiz olunmuş elektron aqreqatdan, temperatur və təzyiq ölçmə sensorlarından, prosessorun verilənləri emal edən elektron lövhədən, yaddaş qurğusundan və yerüstü idarəetmə məntəqəsinə məlumat ötürən qalvanik rabitə kanalından ibarətdir.
Nasos qurğusunun yerüstü avadanlığı və nasos borularını ştanqdan ayırmaq üçün xüsusi qalvanik izolyasiya qurğusu istifadə olunur ki, bu da elektrik izolyasiyasını təmin edir.

**Nəticə**

Quyu dibindən məlumatların şaquli ştanqlarla və boru kəməri ilə təşkil olunmuş qalvanik rabitə kanalı vasitəsi ilə quyu ağzına ötürülməsi ŞDNQ ilə təchiz olunmuş quyulara tətbiq edilməsi imkanları elmi-texniki cəhətdən əsaslandırılmışdır. Ştanqlı dərinlik nasosları ilə təchiz edilmiş quyuların əsas texnoloji parametrlərini ölçməyə və nəzarət etməyə imkan verən məlumat-ölçü kompleksi hazırlanmış və texniki cəhətdən əsaslandırılmışdır. Məlumat-ölçü kompleksinin sınaqları həmin bu quyularda simsiz rabitə kanalının təşkilinin mümkünlüyünü təsdiqləyib.

ƏDƏBİYYAT

1. Mammadov Q.A., Mammadov V.T., Damirova C.R., Huseynli Z.S. Neft-qaz quyularının istismarı və neftin, qazın yıgılması, hazırlanması mashın və avadanlıqları (rus dilində). Derslik. ADNSU-nun neshri, Bakı, 2019, 165 seh.
2. Z.S. Allahverdiyev, J.R.Damirova, Constructıve-technologıcal aspects of ımprovıng of workabılıty and operatıonal ındıcators of borehole boom pumps. Equipment and technologies for oil and gas complex. 2022, (3(129)):14–18. https://journal.gubkin.ru/journals/equipment/2022/3-129/14-18/
3. Mamedov V.T., Aslanov D.N., Damirova D.R. Calculating the Load on the Rod Suspension in Unsteady Oscillation Motion of the Well Pumping Unit Rods. BMSTU Journal of Mechanical Engineering.- 2021, no. 1, pp. 3–10, doi: 10.18698/0536-1044-2021-1-3-10
4. Yasashin V.A., Qimayeva I.F. Osenka kachestvennix xarakteristik neftyanoqo struynoqo nasosa // Equipment and technologies for oil and gas complex. – 2021. – № 6(126). – p. 9–16. – DOI: 10.33285/1999-6934-2021-6(126)-9-16
5. Technology of wıreless ınformatıon transmıssıon ın wells used by deep pumps by Paul Mercier, Phoenix Contact 12/17/2011 Pumps & Systemsç https://www.pumpsandsystems.com/wireless-technology-pump-industry
6. Anantha Babu Ab. Wireless Power Transmission Techniques. Natıonal conference on advancement ın smart power engıneerıng (NCASPE17) April 2017, At: Department of Electrical Technology Karunya University Coimbatore 641 114 Tamil Nadu, India, https://www.researchgate.net/publication/326626064_Wireless_Power_Transmission_Techniques
7. Mustafayev S.D. Quyuların shtanqlı derinlik nasos usulu ile istismarı.- Bakı: Elm, 2010, 678 seh.
8. V.T.Mammadov, Q.Ə.Mammadov İ.Ə.Hebibov, C.R.Dəmirova Osnovi sistem avtomatizasii proyekta.// Derslik, ADNSU-nun neshri.- Bakı, 2017, 205 seh.

# ТЕХНОЛОГИЯ БЕСПРОВОДНОЙ ПЕРЕДАЧИ ИНФОРМАЦИИ В СКВАЖИНАХ, ИСПОЛЬЗУЕМЫХ ГЛУБИННЫМИ НАСОСАМИ

**Джавида Дамирова[1], Эшгин Бабаев[2]**
[1,2]Азербайджанский государственный университет нефти и промышленности, [1,2]кафедра Электроники и автоматики.
[1]канд. техн. наук https://orcid.org/0000-0003-4142-8014, Email: cavida.damirova@asoiu.edu.az
[2]магистр, https://orcid.org/0000-0002-4217-408X, Email: esqinbaba99@gmail.com

## РЕЗЮМЕ

В настоящее время большинство морских и наземных нефтяных скважин представляют собой скважины, эксплуатируемые штанговыми погружными насосами. В странах СНГ



ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

метод глубинных насосов, используемых для добычи нефти, составляет 66% от общего числа методов.

Причина этого в том, что оборудование этих насосов конструктивно простое. С помощью этих насосов ежедневно на поверхность выводится до 500 м$^3$ нефти. Необходимо измерить некоторые параметры на дне скважины, особенно измерение температуры и давления.

Однако в процессе добычи нефти технологические условия и условия в пласте и скважине постоянно меняются. Для управления работой оборудования и принятия оперативных решений требуется непрерывная информация из пласта и скважины. Полученная информация позволяет организовать экономически выгодную добычу нефти, правильно подобрать технологию и оборудование для добычи нефти. Измерение параметров скважины, обработка, сбор и передача информации перед открытием устья – непростая задача, требующая сложных инженерных, математических и логистических знаний.

Линия связи – важнейший элемент, предназначенный для передачи данных от передатчика к приемнику посредством сигнала. В качестве материалов для построения канала связи используются технологические жидкости, электрические кабели, акустические импульсы в металле труб, гидравлические, электрические проводники и создаваемые ими электромагнитные колебания, радиоканал и электромагнитные каналы связи. Также могут быть построены различные комбинации вышеперечисленных методов.

Канал связи состоит из комплекса технических средств, предназначенных для передачи информации от источника, то есть с забоя скважины, к приемнику, то есть на устье ("забой"-"устье").

Этот метод также экономически выгоден, поскольку для установления канала связи используются существующие локальные устройства.Таким образом, мы достигаем основной цели, т.е. надежной и бесперебойной доставки информации от забоя до устья скважины. Проблема передачи информации на устье скважины актуальна и интересна для научной и практической деятельности.

**Ключевые слова:** штанговые глубинные насосы, нефтяные скважины, беспроводная связь, канал связи, гальванический канал связи.

Publication history

Article received: 15.11.2022
Article accepted: 29.11.2022
Article published online: 19.12.2022
DOI suffix: 10.36962/PAHTEI23122022-53


ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

E-ISSN: 2674-5224

VOLUME 23 ISSUE 12 2022 62-72

# CHANGE CHARACTERISTICS OF WELL GEOPHYSICAL PARAMETERS IN OIL FIELDS DUE TO EARTHQUAKES (İN THE EXAMPLE OF THE SEDİMENTS OF THE PRODUCTİVE LAYER)

**Elnur Isazade[1], Parisa Zabolestani[2], Yegane Alibeyova[3]**

[1]Azerbaijan State Oil and Industry University, Master of Geophysics Department, Republican Seismic Survey Center of Azerbaijan National Academy of Sciences, Engineer, Email: isazadelnur@gmail.com

[2]Doctoral student, Baku State University, Department of Seismology and Seismometry, Doctor of Philosophy in Earth Sciences.

[3]Teacher, Department of Geophysics, Azerbaijan State Oil and Industry University,
Email: alibekovayegana@gmail.com

## ABSTRACT

The article shows that on the territory of Azerbaijan, on the basis of gravimagnetic surveys, seismic, electrical and borehole surveys, the thickness of the sedimentary cover is 5-25 km or more, and it is divided into blocks by tectonic faults. As a result of the geophysical planning, structures of anticline and other forms were found in the sedimentary layer, which can accumulate a large amount of oil and gas. Very large reserves of hydrocarbons in the reservoir complexes of these structures, mainly in the deposits of the Productive reservoir. Over the past 25 years, the Azeri, Gunashli, Chirag, Bahar, Bulla Deniz, Shah Deniz, Umid, Babek, Absheron, Karabakh and other fields have been discovered and are being developed. Geological and geophysical studies predict large oil and gas reserves in the promising structures of this region.

The territory of Azerbaijan is also a seismically active territory with a complex geological and tectonic structure. From the historical past to the present, many devastating earthquakes have occurred here, and seismic activity continues to this day. With the activation of geodynamic processes - earthquakes, eruptions of mud volcanoes, a large number of tectonic disturbances are formed in the discovered promising and exploited oil and gas structures, and anomalous changes in geophysical fields are observed in active areas. Under the influence of strong earthquakes, certain changes occur in the physical and mechanical properties of rocks in reservoirs in oil fields, and the indicators of well logs of the same reservoirs differ from each other.

In order to improve methods of conducting geophysical research related to the search and exploration of oil and gas deposits, more accurate determination of the internal structure of oil and gas bearing structures, oil horizons based on geophysical and mine geophysical data, new technologies were used to measure and account for anomalies of geophysical fields caused by geodynamic stresses, as well as the changes observed in the logging data. Anomalous changes in geophysical fields caused by geodynamic stresses and earthquakes and their influence in assessing oil and gas reservoirs are analyzed.

During earthquakes with magnitude $M \geq 5$, depending on the hypocentral distance, different changes in the indices of the geophysical field of the geological environment are observed at different depths. The method of taking into account the characteristics of their changes is given.

The formation of anticlinal, synclinal type structures, where oil and gas deposits are formed in the structures in different periods of geological development, exists due to the influence of certain factors. There is a difference in the distribution of geodynamic factors on the territory, however, the influence of these factors in the region has remained stable with a certain regularity and




maintaining its characteristics for a certain period. As a result, tectonic quantities are regularly and consistently arranged in the formation of structures, as well as zoning.
It has been established that under the influence of earthquakes in geodynamically active areas, in wells drilled at different times and at close distances, different values of logging parameters are observed in one reservoir complex. It is considered expedient to take into account the influence of the geodynamic factor and seismic activity when analyzing well log data from wells drilled in geodynamically active zones.
**Keywords**: anticlinal structures, productive layers, geodynamic stress, seismic activity, anomalous geophysical fields, electrical resistivity, earthquake magnitude, geological environment, etc.

# NEFT YATAQLARINDA QUYU GEOFİZİKİ PARAMETRLƏRİN ZƏLZƏLƏLƏRİN TƏSİRİNDƏN DƏYİŞMƏ XÜSUSİYYƏTLƏRİ (MƏHSULDAR QAT ÇÖKÜNTÜLƏRİNİN TİMSALINDA)

**Elnur İsazadə[1], Parisa Zabolestani[2], Yeganə Əlibəyova[3]**
[1]Azərbaycan Dövlət Neft və Sənaye Universiteti, Geofizika kafedrası, magistr, Azərbaycan Milli Elmlər Akademiyası nəzdində Respublika Seysmoloji Xidmət Mərkəzi, mühəndis, Email; isazadelnur@gmail.com
[2]Bakı Dövlət Universiteti, "Seysmologiya və Seysmometriya" kafedrasının doktorantı, Yer elmləri üzrə fəlsəfə doktoru.
[3]Azərbaycan Dövlət Neft və Sənaye Universiteti, "Geofizika" kafedrası, müəllimə,
Email: alibekovayegana@gmail.com

## XÜLASƏ

Məqalədə Azərbaycan ərazisində aparılmış qravimaqnit, seysmik, elektrik kəşfiyyatı və quyu tədqiqat məlumatları əsasında qurulmuş xəritələrdə çökmə örtüyün qalınlığının 5-25 km və ondan artıq olduğu və tektonik qırılmalarla bloklara ayrıldığı göstərilmişdir. İndiyə kimi aparılan geofiziki planalmalarla çökmə qatda coxlu sayda neft-qaz toplana biləşək antiklinal və başqa formalı strukturlar aşkar edilmişdir. Bu strukturların lay komplekslərində, əsasəndə Məhsuldar Qat çöküntülərində karbohidrogen ehtiyyatları çox zəngindir. Son 25 ildə Azəri, Günəşli, Çıraq, Bahar, Bulla dəniz, Şahdəniz, Ümid, Babək, Abşeron, Qarabağ və s. yataqları aşkar edilmiş və hazırda istismar olunur. Aparılan geoloji, geofiziki tədqiqatlar bu regionda olan perspektivli strukturlarda da çox böyük neft və qaz ehtiyyatlarının olduğuna proqnozlaşdırır.
Azərbaycan ərazisi həmçinin geoloji-tektonik quruluşu mürəkkəb olan seysmoaktiv ərazidir. Burada tarixi keçmişdən indiyə kimi çoxlu sayda dağıdıcı zəlzələlər baş vermiş və seysmik aktivlik indidə davam edir. Aşkar olunmuş perspektivli və neft yatağı kimi istismar olunan strukturlarda, geodinamik proseslərin, zəlzələlərin, paçıq vulkanlarının aktivləşməsi zamanı çoxlu sayda tektonik qırılmalar yaranmış və indi də aktiv sahələrdə geofiziki sahələrin anomal dəyişmələri müşahidə olunur. Güçlü zəlzələlərin təsirindən neft yataqlarında laylarda süxurların fiziki mexaniki xüsusiyyətlərində müəyyən dəyişiklikər yaranır, eyni layların karotaj dioqramlarının göstəriciləri fərqli qeyd edilir.
Neft və qaz yataqlarının axtarışı və kəşfiyyatı ilə əlaqədar geofiziki tədqiqatları daha mükəmməl üsullarla aparmaq, yeni texnologiyalar tətbiq etmək və neftli-qazlı strukturların daxili quruluşunu,

neftli horizontları geofiziki, mədən geofiziki məlumatlar əsasında daha dəqiq təyin etmək üçün deodinamik gərginliyin yaratdığı anomal geofiziki sahələrin dəyişmələrinin, lay komplekslərində neftliliyin-qazlılığın təyinində nəzərə alınması nəzərdə tutulmuş və karotaj məlumatlarında müşahidə olunun dəyişmələr izlənilmişdir. Geodinamik gərginliyin, zəlzələlərin təsirindən neftli-qazlı laylarda geofiziki göstəticilərin anomal dəyişmələrinin öyrənilməsi və interpretasiya zamanı layların neftlilik-qazlılığının qiymətləndirilməsində belə anomal effektlərin nəzərə alınması üsulları təhlil edilmişdir.
Müxtəlif dərinliklərdə maqnitudası M≥5 zəlzələlər olduqda geoloji mühitdə, laylarda süxurların geofiziki sahə göstəricilərində hiposentral məsafədən asılı olaraq fərqli dəyişikliklərlə müşahidə olunur və onların dəyişmə xüsusiyyətlərinin nəzərə alınması üsulu verilmişdir.
Geoloji inkişafın müxtəlif dövrlərində strukturlarda neft – qaz yataqları əmələ gələn antiklinal, sinklinal tip strukturların formalaşması müəyyən amillərin təsirindən mövcud olur. Ərazi üzrə geodinamik amillərin paylanmasında fərqlilik müşahidə olunur, lakin, regionda bu amillərin təsiri müəyyən qanunauyğunluqla və müəyyən dövr ərzində öz xüsusiyyətlərini qorumaqla sabit olaraq qalmışdır. Nəticədə strukturların əmələ gəlməsində tektonik kəmiyyətlərin qanunauyğun şəkildə və ardıcıl olaraq düzülməsi, həmçinin zonalılıq müşahidə olunur.
Geodinamik aktiv ərazilərdə zəlzələlərin təsirindən müxtəlif vaxtlarda, yaxın məsafələrdə qazılmış quyularda eynu lay kompleksində karotaj gostəricilərinin fərqli qiymətlərlə müşahidə olunduğu müəyyən edilmiş və eyni yataqda müxtəlif vaxtlarda qazılmış quyularda zəlzələnin təsirinin nəzərə alınması metodikası şərh edilmişdir. Geodinamik aktiv dövrlərdə, zəlzələlər olanda və təsiri yataqlarda müşahidə olunan müddətdə qazılmış quyuların quyu geofiziki məlumatlarının təhlilində geodinamik amillərdən yaranan dəyişmələrin nəzərə alınması məqsədəuyğun sayılmışdır.
**Açar sözlər:** Antiklinal strukturlar, məhsuldar laylar, geodinamik gərginlik, seysmik aktivlik, anomal geofiziki sahələr, xüsusi elektrik müqaviməti, zəlzələnin maqnitudası, geoloji mühit və s.

## Giriş

Azərbaycan ərazisində aparılmış qravimaqnit, seysmik, elektrik kəşfiyyatı və quyu tədqiqat məlumatları əsasında qurulmuş xəritələrdə çökmə örtüyün qalınlığının 25 km-dən artıq olduğu və tektonik qırılmalarla bloklara ayrıldığı göstərilmişdir [1, 3]. İndiyə kimi aparılan geofiziki planalmalarla çökmə qatda coxlu sayda neft-qaz toplana biləşək antiklinal və başqa formalı strukturlar aşkar edilmişdir. Bu strukturların lay komplekslərində, əsasəndə Məhsuldar Qat çöküntülərində karbohidrogen ehtiyyatları çox zəngindir. Son 25 ildə Azəri, Günəşli, Çıraq, Bahar, Bulla dəniz, Şahdəniz, Ümid, Babək, Abşeron, Qarabağ və s. yataqları aşkar edilmiş və hazırda istismar olunur. Aparılan geoloji, geofiziki tədqiqatlar bu regionda olan perspektivli strukturlarda da çox böyük neft və qaz ehtiyyatlarının olduğuna proqnozlaşdırır.
Azərbaycan ərazisi həmçinin geoloji-tektonik quruluşu mürəkkəb olan seysmoaktiv ərazidir. Burada tarixi keçmişdən indiyə kimi çoxlu sayda dağıdıcı zəlzələlər baş vermişdir (1139 Göy-Göl Gəncə-Kəpəz zəlzələsi, Şamaxı 1669, 1902 zəlzələsi və s.) və seysmik aktivlik indidə davam edir. Aşkar olunmuş perspektivli və neft yatağı kimi istismar olunan strukturlarda, geodinamik proseslərin, zəlzələlərin, paçıq vulkanlarının aktivləşməsi zamanı çoxlu sayda tektonik qırılmalar yaranmış və indidə aktiv sahələrdə geofiziki sahələrin anomal dəyişmələri müşahidə olunur [2, 3, 12]. Güçlü zəlzələlərin təsirindən neft yataqlarında laylarda süxurların fiziki mexaniki xüsusiyyətlərində müəyyən dəyişiklikər yaranır, eyni layların karotaj dioqramlarının göstəriciləri fərqli qeyd edilir.


ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

**Məqsəd**

**Problemin aktuallığı və əlaqəli tədqiqatlar.** Neft və qaz yataqlarının axtarışı və kəşfiyyatı ilə əlaqədar geofiziki tədqiqatları daha mükəmməl üsullarla aparmaq, yeni texnologiyalar tətbiq etmək və neftli-qazlı strukturların daxili quruluşunu, neftli horizontları geofiziki, mədən geofiziki məlumatlar əsasında daha dəqiq təyin etmək üçün deodinamik gərginliyin yaratdığı anomal geofiziki sahələrin dəyişmələrinin, lay komplekslərində neftliliyin-qazlılığın təyinində nəzərə alınması günün **ən aktual** problemlərindən biridir.

Geodinamik gərginliyin, zəlzələlərin təsirindən neftli-qazlı laylarda geofiziki göstəticilərin (seysmik dalğa sürətinin, süxurların elektrik müqavimətinin, maqnit və radiasiya sahələrinin və s.) anomal dəyişmələrinin öyrənilməsi və interpretasiya zamanı layların neftlilik-qazlılığının qiymətləndirilməsində belə anomal effektlərin nəzərə alınması üsullarının işlənib hazırlanması qarşıya **məqsəd** qoyulmuşdur.

Azərbaycan ərazisində geoloji inkişaf tarixi dövründə maqmatik proseslər, intruzivlərin yaranması, zəzələlərlə əlaqəli seysmogeodinamik aktivlik, müxtəli istiqamətli geotektonik hərəkətlər, palçıq vulkanlarının intensiv fəaliyyəti və s. regionun struktur quruluşunda əvvəldə qeyd olunduğu kimi çox xarakterik geoloji izlər qoymuş və bu proseslər indidə intensiv olaraq davam edir [1, 12, 13]. Müxtəlif dərinliklərdə maqnitudası M≥5 zəlzələlər olduqda geoloji mühitdə, laylarda süxurların geofiziki sahə göstəricilərində hiposentral məsafədən asılı olaraq fərqli dəyişikliklərlə müşahidə olunur və onların dəyişmə xüsusiyyətlərinin öyrənilməsi olduqca vacibdir.

**Həll olunacaq məsələlər və tədqiqatın aparılma ardıcıllığı:**

1. Azərbaycan ərazisində baş verən zəlzələlərin hiposentrlərinin dərinlik üzrə paylanma xüsusiyyətlərinin müəyyən edilməsi.
2. Müxtəlif dərinliklərdə baş verən maqnitudası M≥5 zəlzələlərin Məhsuldar Qat çöküntü kompleksində təsirinin nəzərə alınması üsulunun tətbiqi.
3. Məhsuldar Qat çöküntülərində deodinamik gərginliyin təsirindən karotaj göstəricilərinin dəyişmələrinin müqayisəli araşdırılması.

Azərbaycan ərazisinin seysmik aktivliyi həmişə yüksək olmuş və tarixi keçmişdən indiyə kimi maqnitudası M≥5 zəlzələlərin baş vermişdir. Azərbaycan ərazisidə və ətraf regionda 2003-2018-ci illərdə maqnitudası M≥3.0 baş verən zəlzələlərin episentrlər xəritəsində a) və baş vermiş zəlzələlərin ocaq mexanizmi xəritəsində neftli-qazlı ərazilərdə çoxlu sayda zəlzələlərin episentrləri və dərin qatlarda zəlzələ ocaqlarının olduğu müşahidə olunur [1, 12, 15].

**Metodlar**

Müqayisəli təhlil və yeni yanaşma üsulları. **Bu regionda baş verən zəlzələ** ocaqlarının dərinliyi yer səthindən 60-100 km intervalında olduğu və əsasəndə çökmə qatda daha çox zəlzələ ocaqlarının olduğu müəyyən edilmişdir (şəkil 2). Azərbaycan ərazisində Kür Çökəkliyi, Xəzər dənizi və Şərqi Kopetdağ istiqamətli profildə hiposentrlərin dərinlik üzrə paylanması a) və Azərbaycan ərazisində 2003-2018-ci illərdə (M≥3.0) baş verən zəlzələlərin hiposentrlərinin dərinlik üzrə paylanması qrafikində b) Çökmə qatın geodinamik gərginliyinin daha aktiv və intensiv olduğu görünür (şəkil 2). Baş verən zəlzələlərin 60-70 faizi Çökmə qatda olmuş və lay komplekslərində geodinamik gərginlik yaratmışdır.

ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 23 ISSUE 12 2022




**Şəkil 1.** Azərbaycan ərazisidə və ətraf regionda 2003-2018-ci illərdə (ml ≥ 3.0, N=1877) baş verən zəlzələlərin episentrlər xəritəsi a) və baş vermiş zəlzələlərin ocaq mexanizmi xəritəsi b) [12, 13].




**Şəkil 2.** Azərbaycan ərazisində Kür Çökəkliyi, Xəzər dənizi və Şərqi Kopetdağ istiqamətli profildə (profil 2) hiposentrlərin dərinlik üzrə paylanması a) Azərbaycan ərazisində 2003-2018-ci illərdə (ml ≥ 3.0) baş vermiş zəlzələlərin hiposentrlərinin dərinlik üzrə paylanması qrafiki b) (Tərtib edənlər: H.Ö.Vəliyev, S.E.Kazımova 2020) [1, 13].

Çökmə qatın gərginlik deformasiya şəraitinin, seysmogeodinamik aktivliyinin anomal xüsusiyyətləri və palçıq vulkanlarının dinamik aktivliyi hazırda da istimarda olan yataqlarda müşahidə olunur. Çökmə qatda bloklar arası tektonik qırılmalarında, antiklinal tip strukturlarda qırılmaların amplitudu 5-10 m-dən 1500-2000 m-ə yerdəyişmə ilə müşahidə olunur [1, 12, 13]




Əksəriyyət antiklinal tip strukturların geoloji kəsilişlərində üst qatlarda deformasiya, gərginlik, seysmik aktivlik artır və tektonik qırılmalar, mürəkkəb seysmik yazı zonaları və karotaj dioqramlarında eyni layın göstəricilərinin fərqli qiymətlərlə müşahidə olunduğuna rast gəlinir [1, 3, 7, 8, 9]

**Təsiri neft yataqlarında müşahidə olunan zəlzələlərin tədqiqatın üsulları.**

Neft yataqlarının axtarışı və kəşfiyyatı mərhələsində, yataqların istismarı zamanı geofiziki məlumatların emalı və interpretasiyasının nəticələrinin dəqiq olmasına nail olmaq üçün geofiziki sahə göstəricilərin geodinamik gərginlik şəraiti nəzərə almaqla təhlil olunması mühüm əhəmiyyət kəsb edir [3, 4, 8, 10]

Hazırda istismarda olan neft və qaz yataqlarında müasir seysmik üsullarla 2D, 3D və 4D seysmik planalmalar aparılır. Yataqlarda və perspektivli strukturlarda 7 km dərinliyə kimi çoxlu sayda quyular qazılır və karotaj ölçmələri yerinə yetirilir. Alınan geofiziki məlumatların təhlilində demək olar ki, geodinamik gərginliyin təsirindən yaranan anomal geofiziki sahə dəyişmələri nəzərə alınmır və nəticədə layların ayırıcı sırhədlərinin təyinində, neftli-qazlı layların neftlilik-qazlılığının qiymətləndirilməsində təhrifliyə yol verilir [1, 3, 5, 6, 11]. Bəzən seysmik üsulla təyin edilmiş əksetdirici sərhəd 10-100 mert səhih qiymətlə təyin olunur, neftli-qazlı obyekt isə qeyri məhsuldar lay kimi göstərilir və əksinə qiymətləndirilir.

Geodinamik aktivləşmə müşahidə olunan dövrlərdə geofiziki planalma sahəsində, dərinlik seysmik kəsilişlərdə və həmin dövrlərdə yeni qazılmış quyulsrda aparılan karotaj məlumatlarının təhlilində geodinamik gərginliyin, zəlzələlərin təsirindən geofiziki sahələrin dəyişmə effektini təyin etmək məqsədilə baş verən zəlzələlərin təsiri aşağıdakı ardıcıllıqla seçilir:

1. Geofiziki planalma sahəsində təsiri müşahidə olunan zəlzələlərin paramertləri (hadisənin vaxtı, zəlzələ ocağının koordinatları, hiposentrin dərinliyi, ocağın həcmi ölçüləri, ocaqda enerjinin toplanma müddəti və s.) Azərbaycan Seysmoloji Xidmət Mərkəzinin hazırladığı kataloqlardan istifadə olunmaqla seçilir.
2. Quyu kəsilişində süxurların litoloji və fiziki xüsusiyyətlərini anomal dəyişə bilən zəlzələlərin ocaqda toplanan enerjisinə (E), maqnitudasına (M) uyğun geofiziki sahələrin (xüsusi elektrik müqaviməti, quyu potensialı və s.) dəyişmələri müəyyənləşdirilir [1, 14, 15]. Baş vermiş zəlzələlərin təsirini və yarada biləcəyi anomal dəyişiklikləri əhatə edən məsafələr, yəni zəlzələrin təsir radiusları V.İ.Ulomovun, İ.P.Dobrovolskinin, S.İ.Zubkovun və V.N.Myaçkinin üsullarına uyğun olaraq hesablanır:

$$\Delta\rho = 10^{0,43\,M}, \text{км.} \qquad (1)$$

Burada, $\Delta\rho$ - zəlzələ ocağında toplanan potensial gərginlik enerjisinin təsirinin quyuya qədər olan hiposentral məsafəsidir; M-zəlzələnin maqnitudasıdır.

Ocaqda zəlzələ anına kimi potensial gərginlik enerjisinin toplandığı müddət:

$$\Delta t = 10^{0.74\,M-4.60}, \text{il}, \qquad (2)$$

hesablanır.

Zəlzələnin maqnitudasına uyğun hiposentral )məsafəni təyin etmək üçün paletka qurulmuş (şəkil 3) və zəlzələnin təsir radiusu (Δρ) hesablanır. Həmçinin zəlzələ ocağında enerjinin tolanma müddəti (Δt) təyin edilir.




**Şəkil 3.** Zəlzələlərin maqnitudasına (M) uyğun hiposentral təsir məsafəsinin təyini üçün paletka. Zəlzələnin maqnitudasına uyğun hiposentral məsafəni təyin etmək üçün paletka

**Cədvəl 1**

| Maqnituda, M | 1,5 | 2,1 | 2,7 | 3,3 | 3,8 | 4,4 | 5,0 | 5,5 |
|---|---|---|---|---|---|---|---|---|
| Episentral məsafə ΔR, кm | 4,5 | 8,0 | 15,0 | 26,0 | 43,0 | 80,0 | 140,0 | 230,0 |
| Enerjinin tolanma müddəti Δt, vaxt | 3 saat | 8 saat | 1 gün | 2,5 gün | 6 gün | 17 gün | 50 gün | 180 gün |

Zəlzələlərin təsir dairəsinə düşən sahələrdə geodinamik gərginliyin anomal artması layın elastiklik modulunun – E, lay-kollektorlarda xüsusi müqavimətin - $\rho_{süx}$, məsaməliliyin - m, keçiricilik əmsalının – k, su ilə doyma əmsalının – $K_{doy}$, müqavimətlər nisbətinin - $\rho_{süx}/\rho_{doy}$ və s. müxtəlif xarakterli dəyişməsinə səbəb olur. Əvvəlki tədqiqatlarımızda Aşağı Kür çökəkliyinin bir sıra neft yataqlarında (Mişovdağ, Kürovdağ, Kürsəngə və s.) qeyd olunan parametrlərin zəlzələdən əvvəl və sonra anomal dəyişdiyi müəyyən edilmişdir [1, 3, 4]

Geodinamik gərginliyin təsirindən bir sıra laylarda karotaj göstəriciləri aşağı olsada (2,0-2,5 Omm) sonralar həmin layların neftli-qazlı olduğu müəyyən edilmişdir. Bəzəndə layların karotaj göstəriciləri yuksək olur (8-12 Omm) və məhsuldar obyekt kimi qiymətləndirilir, ancaq sınaq

E-ISSN: 2674-5224
VOLUME 23 ISSUE 12 2022

ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

zamanı verilən rəy təsdiqini tapmır [3]. Bele hallann yaranmasmln bir sıra səbəbi ola bilər, onlardan ən çox təsiri seysmogeodinamik aktiv prosesin olması bizim tərəfimizdən elmi əsaslandırılmışdır. Laborator eksperimentler və geodinamik poliqonlarda aparılan geofiziki sahə dəyişmələrinin təhlili göstərir ki, baş verən zəlzələlərin təsirindən laylarda və süxur komplekslərində geofiziki sahə göstəriciləri (seysmik dalğaların sürətləri, elektrik keçiriciliyi, qravimaqnit sahə göstəriciləri, radioaktiv sahə parametrləri və s.) lokal sahələrdə, zəlzələnin təsir radiusundan və maqnitudasından asılı olaraq, müəyyən zaman intervalında (zəlzələ ocağında geodinamik enerjinin toplanmasına uyğun) 15-20 % dəyişə bilər [3].
Azərbaycan ərazisində neftlilik-qazlılıq potensialı yüksək olan Miosen, Pliosen, əsasəndə Məhsuldar Qat çöküntülərinin timsalında baş verən zəlzələlərin hiposentrlərinin dərinliklərindən, hiposentral məsafədən və zəlzələ ocaqlarının mühitdə paylanma xüsusiyyətlərindən asılı olaraq geofiziki sahələrin dəyişmələri araşdırılmışdır. Şərti seçilməş yataqda müxtəlif vaxtlarda, yaxın məsafələrdə qazılmış quyuların karotaj əyrilərinin eyni lay kompleksində göstəriciləri müqayisə edilmişdir (şəkil 4).




**Şəkil 4.** Şərti yataqda müxtəlif vaxtlarda, yazın məsafədə qazılmış quyuların karotaj əyrilərində

Məhsuldar Qatın uyğun laylarında geofiziki dəyişmələrin fərqli göstəricilərlə müşahidə olunduğu dioqramlar.
Eyni layın müxtəlif yerlərində karotaj göstəriciləri xeyli fərqli, ancaq uyğun qiymətlərlə müşahidə olunur. Belə dəyişmələrin səbəbi mühitdə baş verən litoloji, petrofiziki və s. amillərlə əlaqəli olduğu güman olunur. Bizim fikrimizcə belə dəyişmələrə səbəb olan amillərdən biridə geodinamik gərginliyin, zəlzələlərin təsirindən yaranan amildir. Layların neftlilik-qazılığının

qiymətləndirilməsində karotaj məlumatlarının təhlilində bu amilin nəzərə alınmasının vacib olduqu göstərilmişdir.

**Nəticə**

Geodinamik aktiv ərazilərdə zəlzələlərin təsirindən müxtəlif vaxtlarda, yaxın məsafələrdə qazılmış quyularda eynu lay kompleksində karotaj gostəricilərinin fərqli qiymətlərlə müşahidə olunduğu müəyyən edilmişdir.

Eyni yataqda müxtəlif vaxtlarda qazılmış quyularda zəlzələnin təsirinin nəzərə alınması metodikası şərh edilmişdir.

**Təklif**

Geodinamik aktiv dövrlərdə, zəlzələlər olanda və təsiri yataqlarda müşahidə olunan müddətdə qazılmış quyuların quyu geofiziki məlumatlarının təhlilində geodinamik amillərdən yaranan dəyişmələrin nəzərə alınması məqsədəuyğun sayılmışdır.

**ƏDƏBİYYAT**

1. Veliyev H.O. 2022. Yerli zelzeleler ve onların parametrlerinin tedqiqi usulları.- Bakı: AQM Quality MMC. 272 seh.
2. Vəliyeva V.A., Kabulova A.Y., Hüseynova T.S. Aşağı Kur chokekliyi və Bakı arxipelagı depressiya zonalarında derinlikdə yatan chokuntu qatının struktur-tektonik sheraiti və neft-qazlılıq perspektivliyi // Azerbaycan neft teserrufatı, 2015, No 12, s. 3-9.
3. Cəfərov R.R., Hacıyev E.S. İshlenmenin son merhelesində olan yataqlarda yeni tektonik blokların və stratiqrafik kəsilishlerin ashkar edilmesinə dair. //Azerbaycan Neft Teserrufatı. – Bakı, 2012, №9. – Səh.5-10.
4. Seferov R., Ehmedova E. Azerbaycan erazisinin muasir geodinamik sheraiti: GPS və seysmik melumatlar esasında.// Azerbaycanda Geofizika Yenilikleri .- 2018, №2, s. 47-52
5. Veliyev H.O., Seferova S.H. 2012. Qaz anbarlarında guclu zelzelelerin tesirinin nezere alınması ve ekoloji riskin qiymetlendirilmesi. Azerbaycanda seysmik xidmetin yaradılmasının 11 illiyine hesr olunmus beynelxalq konfrans. -Bakı 7-12 oktyabr 2012, s.39.
6. Valiyev H.O. Geodinamic model, seismic activity of the south Caspian basin and perspective direction of oil and gas fields exploration, Seismoprogn, Observ. Territ. Azerb. -2016, V. 13, №1, pp.32-37.
7. Veliyev H.O., Veliyev R.V. Xezer chokekliyinin plyum mantiya modeline uyqun emele gelme elametleri, muasir geodinamik-gerginlik seraiti ve karbohidrogen potensialı. //Azerbaycanda Geofizika Yenilikleri.- 2018, №2, s. 54-59.
8. Veliyev H.O., Kazımov E.A. Qazıma prosesinde seysmogeodinamik amillərin anomal deyismelerinin nezere alınması.// Neft Tesettufatı Jurnalı.-2020, №12, s. 17-24.
9. Veliyev H.O., Zeynalov R.M., Kazımov E.A., Ehmedov T.M.. Derin quyuların qazılması prosesinde geodinamik gerginlikle elaqeli seysmoloji ve seysmik amillerin nezere alınmasının vacibliyi.// Neft Tesettufatı Jurnalı.- 2021, №2. s.10-15.
10. Veliyev H.O., Veliyev R.V. Factors of drilling Hazards Caused by geodynamic stress. Qeoloqiya i poleznie iskopaemie mipovoqo okeana tom 14 * 4*(54).- Kiev, 2018, № 4, p. 74-81

ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 23 ISSUE 12 2022
90-96

# ABOUT ONE TECHNIQUE FOR ESTIMATING WAVE LOADS ON OFFSHORE PLATFORMS

**Rugiya Askerova**
Assistant of department "Oil, gas transportation and storage", Azerbaijan State Oil and İndustry University.
Email: rugiya.askerova.74@mail.ru

## ABSTRACT

Offshore oil and gas facilities are continuously under the influence of various loads, from which wave loads, wind loads, loads from underwater currents, loads from the weight of the structure itself, dynamic loads from the operation of drilling and other technological equipment can be distinguished. Among these loads, especially for the conditions of the Caspian Sea, the most dangerous are wave loads, which, as shown by many years of operating experience, can lead to significant damage to the structure.

It should be noted that the wave calculation of the supporting blocks of offshore platforms by designers for many years took a lot of time due to the complexity of the calculation formulas used. Therefore, the creation of computer software and graphical tools has opened up wide opportunities for the application of modeling methods, in particular computer modeling. At present, in the design of offshore oil and gas facilities, in particular the support blocks of stationary platforms, computer software systems with 3D modeling capabilities are widely used, which allow estimating wave loads on elements of the support block with various combinations of initial data . At the output of the execution of these programs, the condition for satisfying the criterion of strength and stability under wave loading is checked. If the structure does not meet the conditions of strength and stability, the initial data is corrected (for example, new connections are introduced, the values of the diameters of individual tubular elements and the thickness of their walls increase) and a recalculation is performed. The computational process is performed until the computer program issues a message about the satisfaction of the criterion of strength and stability of the considered constructive solution.

At the same time, there are different approaches to the modeling of wave action, as a dynamic physical process, and, accordingly, different methods for their evaluation, although wave calculations are carried out by design organizations according to accepted design standards.

The paper analyzes the main dynamic loads on structural elements of offshore oil and gas facilities, and on the basis of this analysis, the main factors that determine wave loads are identified. The main results of theoretical and experimental studies on the study of wave action on pipe elements of structures of offshore oil and gas facilities are presented.

On the basis of the conducted studies, an algorithm for calculating wave loads is proposed, which is recommended for the initial assessment of the stress-strain state in vertical piles of the platform's jackets. The proposed algorithm provides for the sequential execution of steps, which includes the calculation of the orbital motion of fluid particles along the depth of the sea, the calculation of the portable movement of fluid under the influence of wind waves, the calculation of the acceleration of fluid particles, and at the final step, the wave pressure on the tubular pile is directly estimated. This pressure is the sum of the velocity and inertial components. At the output of the implementation of the algorithm, a wave pressure diagram is constructed from the calculated values of the wave pressure at the calculated six points.




The proposed algorithm is based on physical concepts of the formation of wind waves and the mechanism of wave action on a tubular vertical pile, which have been confirmed with sufficient accuracy both in laboratory conditions and in field experiments.
On the basis of a computational algorithm for performing wave calculations, a program was compiled and implemented on a computer, which can be recommended for use in the design of supporting blocks of offshore platforms.
**Keywords:** platform, jacket, wave loads, wave pressure, modelling

## DƏNİZ PLATFORMALARINA DALĞA YÜKLƏRİNİN TƏSİRİNİN QİYMƏTLƏNDİRİLMƏSİNİN BİR ÜSULU HAQQINDA

**Ruhiyyə Əsgərova**
assistent, "Neftin, qazın nəqli və saxlanması" kafedrası, Azərbaycan Dövlət Neft və Sənaye Universiteti,
Email: rugiya74@mail.ru

### XÜLASƏ

Dəniz neft-qaz qurğularının layihələndirilməsi qəbul olunmuş normalara əsasən aparılmasına baxmayaraq, dalğa təsirinin modelləşdirilməsinə müxtəlif yanaşma üsulları və uyğun olaraq müxtəlif qiymətləndirilmə metodikaları mövcuddur.
Baxılan işdə dəniz neft-qaz qurğularının konstruksiya elementlərinə təsir edən əsas dinamik yüklər təhlil olunmuş və dalğa yüklərinin təsiri amilləri müəyyən olunmuşdur.
Aparılan tədqiqatlar nəticəsində dalğa yüklərinin hesablanması üçün alqoritm təklif olunmuşdur. Həmin alqoritm ardıcıl addımların yerinə yetirilməsini nəzərdə tutur və buraya su hissəciklərinin orbital hərəkətinin, küləyin təsirindən qovulma hərəkətinin, su hissəciklərinin aldıqları təcillərin hesablanması və sonda boru svayına təsir edən dalğa təzyiqinin qiyməti hesablanır. Bu qiymət sürət və inersial basqıların cəmi kimi tapılır. Alqoritmin icrasının sonunda hesabi altı nöqtəyə görə dalğa təzyiqinin epürası qurulur.
Təklif olunan alqoritm külək dalğalarının və şaquli boru svaylarına dalğa təsirinin mexanizminin formalaşmasına dair mövcud fiziki təsvirlərinə əsasən tərtib edilmişdir. Həmin təsvirlər kifayət qədər dəqiqliklə həm laboratoriya şəraitində, həm də real istismar şəraitində aparılan tədqiqatların nəticələri ilə təsadiqlənmişdir.
Hesablanma alqoritmi əsasında dalğa hesabatının aparılması üçün proqram tərtib edilmiş və kompüterdə icra olunmuşdur. Həmin proqram dəniz platformalarının dayaq bloklarının layihələndirilməsində istifadəyə üçün tövsiyyə oluna bilər.
**Açar sözlər:** platforma, dayaq bloku,dalğa yükləri, dalğa təzyiqi, modelləşdirilmə

### Giriş

Hal-hazırda karbohidrogen eytiyatların (neftin, qazın, qaz kondensatının) əksəriyyəti dəniz yataqlarından hasil olunur. Bu zaman kəşviyyat və istismar quyuları əsasən dəniz platformalarından aparılır. Bu qurğuların konstruksiya elementləri müxtəlif yüklərin (dalğa, külək, sualtı axınlardan yaranan və sairə yüklərin) təsiri altında qalır. Xəzər dənizi şəraitində dalğa yükləri xüsusi əhəmiyyət kəsb edir. Belə ki, Xəzərin dəniz yataqlarının istismar təcrübəsi

göstərir ki, dalğa yükləri elə qiymətlər çata bilər ki, estakada qurğularında, dəniz stasionar platformalarda və digər hidrotexniki tikililərdə ciddi zədənmələr müşahidə olunub.
Yuxarıda deyilənlərlə əlaqədar olaraq, dəniz neft-qaz qurğularının layihələndirilməsi zamanı müxtəlif dinamiki yüklərin, o cümlədən müxtəlif konstruksiya elementlərinə dalğa yüklərinin qiymətləndirilməsi məsələsi aktual olaraq qalmaqdadır.
Dünya praktikasında müxtəlif qurğulara təsir göstərən dalğa yüklərinin hesablanmasında ən geniş tətbiq olunan metodologiya Morison düsturu yaxud hidrodinamiki nəzəriyyəsinə əsaslanır [1,3]. Birinci yanaşma dalğaların qeyri-xətti səciyyəsini tam şəkildə nəzərə almaqla məhdud hündürlüklü dalğalardan yaranan yüklərin hesablanmasına imkan verir. Lakin bü metodologiya yalnız o qurğulara şamil oluna bilər ki, konstruksiya elementlərinin ölçüləri dalğanın uzunluğundan xeyli kiçikdir. Bundan başqa belə yanaşmada elementlərin yaxud yaxında yerləşən digər tikililərin biri birinə qarşılıqlı hidrodinamiki təsirlərin göstərilməsi istisna olunur.
Hidrodinamiki nəzəriyyənin tətbiqi isə yaranan difraksiya effektlərini və qarşılıqlı hidrodinamik təsirləri nəzərə alır, lakin məhdud hündürlüyü olan dalğaların təsirindən yaranan yüklərin hesablanmasına bir o, qədər imkan vermir. Böyük ölçülərə və mürəkkəb konstruksiya formalarına malik olan dəniz qurğuların əksəriyyəti üçün hidrodinamik nəzəriyyəni tətbiq etməklə daha dəqiq nəticələr əldə etmək olur, çünki bu zaman cisimlərin su ilə yuyulmasınınn mürəkkəb prosesləri nəzərə alınır.
Qurğuların davranışını təhlil etdikdə adətən requlyar yaxud requlyar olmayan dalğa həyacanı halına baxılır. Ümumi halda, dalğa həyacanı məlum spektrlərdən biri ilə təsvir oluna bilər ki, bunu müəyyən amplituda, tezlik və təsadüfi faza qiymətləri olan elementar rəqslərin kombinasiyası kimi modelləşdirmək olar.
Dalğaların formalaşması, əsas parametrləri və onların paylanmasına dair mövcud nəzəri və eksperimental baza, həmçinin dəniz neft qaz qurğularının çoxillik təcrübəsi dalğa hesabatının aparılması üçün hal-hazırda qüvvədə olan norma və qaydalarını elmi cəhətdən əsaslandırır. Dəniz qurğularında dalğa həyacanının öyrənilməsi istiqamətində aparılan tədqiqatların sonrakı inkişafı və xüsusilə kompüter modelləşdirilməsinin geniş tətbiqi imkanları müasir proqram hesablanma komplekslərinin yaradılmasına gətirib çıxartmışdır [2,4,5].

**Məqsəd**
SOCAR-ın "Neftqazelmtədqiqat" İnstitunda uzun illər ərzində aparılan nəzəri və təcrübi tədqiqatlar əsasında geniş elmi material toplanmışdır. Dalğa həyacanın formalaşması və təsirinin modelləşdirilməsi təsdiqlənmiş elmi müddəalara əsaslanır. Bu elmi müddəalardan biri odur ki, dalğa profili su hissəciklərinin küləyin təsirindən qovulması hərəkəti ilə həmin hissəciklərin elliptik orbitlər üzrə olan hərəkətinin üst üstə düşməsi hesabına yaranır. Şaquli boru svayına dənizin dərinliyi boyunca təsir edən dalğa təzyiqi sürət və inersial basqının cəmi kimi tapılır. Lakin bu fiziki prosesi təsvir edən düsturlar mürəkkəb olduğundan və dalğa yüklərinin hesablanması ilkin verilənlərin müxtəlif kombinasiyasında aparıldığından ilk növbədə cevik hesablanma alqoritminin qurulmasına eytiyac vardır. Baxılan işdə aparılan tədqiqatların məqsədi belə alqoritmin və müvafiq proqramım qurulması və kompüterdə icrası olmuşdur.

**Metodlar**
Məqalədə nəzəri və eksperimental tədqiqatlar nəticəsində dalğa həyacanına, dalğa parametlərin paylanmasına və dalga təzyiqinin formalaşmasına dair coxillik elmi məlumatdan geniş istifadə olunmuşdur. Dalğa həyacanının yaranması və onun dayaq blokunun boru elementlərinə təsirinin


ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

qiymətləndirilməsində hidrodinamiki nəzəriyyə, dalğa nəzəriyyəsi elementlərindən və modelləşdirilmə üsullarından istifadə olunmuşdur. Bundan başqa qrafiki və proqram vasitələrindən istifadə edərək, yekunda hesablanma alqoritminin blok sxemi qurulmuşdur. Dalğa təzyiqinin epürasının qurulmasında MS Excell proqramının imkanlarından istifadə etməklə hesablanmış nöqtələri hamar əyri tərəfindən verilməsi və Simpson düsturunun köməyi ilə dalğa təzyqinin yekun ortalanmış qiyməti təyin olunmuşdur.

**Nəticə**

Aparılmış tədqiqatlar nəticəsində ayrıca dayanmış şaquli svaya təsir edən dalğa təzyiqinin təyini üçün hesablanma alqoritmi qurulmuşdur. Hesablanma alqoritmin blok sxemi aşağıda təsvir olunmuşdur (Şəkil).

Həmin alqoritmi ardıcıl yerinə yetirilən addımlar kimi təsvir etmək olar.

Addım 1. İlkin verilənlərin daxil olunması: dənizin dərinliyi (H); dalğanın hündürlüyü (h); dalğanın uzunluğu (L); boru svayının diametri (D); dəniz suyunun xüsusi çəkisi (γ).

Addım 2. Su hissəciklərinin orbital hərəkəti (elliptik orbitlərin üfüqi və şaquli radiusları hesablanır. Bu və sonrakı mərhələdə hesablanmalar altı nöqtəyə görə aparılır (həmin nöqtələr dənizin sakit səviyyəsindən başlayaraq, dənizion dibinə qədər 0,2H aralıqda ardıcıl götürülür).

Addım 3. Küləyin təsirindən su hissəciklərin qovulması hərəkətinin hesablanması (su hissəciklərinin sürəti qiymətləri hesablanır və bu qiymətlər 5-ci addımda dalğa təzyiqinin sürət toplananın təyini zamanı istifadə olunur.

Addım 4. Su hissəciklərin təcilinin hesablanması (hesablanmış qiymətlər 5-ci addımda dalğa təzyiqinin inersial toplananın təyini zamanı istifadə olunur).

Addım 5. Dalğa təzyiqinin ayrılıqda sürət və inersial toplananlarının hesablanması və sonradan dalğa təzyiqinin həmin toplananların cəmi kimi tapılması.

Addım 6. Dalğa təzyiqi epürasının qurulması və dalğanın təsirindən yaranan əyici momentin təyini.

Alqoritminin icrasının çıxışında qurulan epüranın təhlili göstərir ki, dənizin dərinliyi artdıqca dalğa təzyiqinin qiyməti azalır və müəyyən dərinlikdən sonra boru svayına dalğanın təsirini nəzərə almamaq olar.

Beləliklə dəniz neft-qaz qurğularına dalğa həyacanını formalaşdıran əsas parametrlər və təsir amilləri müəyyən olunmuşdur. Bunlar küləyinsürəti, dənizin dərinliyi, dalğanın uzunluğu və hündürlüyü, boru svayının diametri və dəniz suyunun sıxlığıdır. Dalğa həyacanın təsirinin cıxış parametri kimi dalğa təzyiqinin hesablanmış qiymətini götürmək olar.

Tədqiqatlar nəticəsində qurulmuş hesablanma alqoritmi stasionar dəniz platformalarının dayaq bloklarının layihələndirilməsi ilə məşğul olan müəssisələr tərəfindən istifadə üçün tövsiyyə oluna bilər.




**Şəkil 1.** Dalğa təzyiqinin hesablanması üçün alqoritm

Beləliklə dəniz neft-qaz qurğularına dalğa həyacanını formalaşdıran əsas parametrlər və təsir amilləri müəyyən olunmuşdur. Bunlar küləyinsürəti, dənizin dərinliyi, dalğanın uzunluğu və hündürlüyü, boru svayının diametri və dəniz suyunun sıxlığıdır. Dalğa həyacanın təsirinin cıxış parametri kimi dalğa təzyiqinin hesablanmış qiymətini götürmək olar.





Tədqiqatlar nəticəsində qurulmuş hesablanma alqoritmi stasionar dəniz platformalarının dayaq bloklarının layihələndirilməsi ilə məşğul olan müəssisələr tərəfindən istifadə üçün tövsiyyə oluna bilər.

## ƏDƏBİYYAT


1. Askerova R.I. O volnovom vozdeystvii na morskiye qidrotekhncheskiye soorujeniya /Bulatovskiye chteniya. Sbornik statey. -2018, s. 51-53.
2. Ankit Aggarwal, Hans Bihs, Seimur Shirinov, and Dag Myrhaug Estimation of breaking wave properties and their interaction with a jacket structure /Journal of Fluifs and Structures.- 2019, 91, pp.102722.
3. Jianjun Huang, Guoping Chen Experimental modelling of wave load on a pile-supported wharf qith pile breakwater /Ocean Engineering. -Volume 201, 1 april 2020, 107149.
4. Peter S. Tromas and Luc Vandershuren Wave loads on offshore structures / 7th International Conference on Experiments/Process /System Modelling/ Simulation/ Optimization. Athens, 5-8 Julay, 2017, pp.1-9.
5. Xiaojie Tian, Qingyang Wang, Guijie Liu, Yingchun Xie, Wei Deng Topology optimization design for offshore platform jacket structure /Applied Ocean Research.- 2019 84 , pp.38-50.


# ОБ ОДНОЙ МЕТОДИКЕ ОЦЕНКИ ВОЛНОВЫХ НАГРУЗОК НА ОПОРНЫЙ БЛОК МОРСКИХ ПЛАТФОРМ

**Ругия Аскерова**
ассистент кафедры «Транспорт и хранение нефти и газа», Азербайджанский государственный университет нефти и промышленности, Email: rugiya74@mail.ru

## РЕЗЮМЕ

В работе производится анализ основных динамических нагрузок на элементы конструкций морских нефтегазовых сооружений и на основе этого анализа выделены основные факторы, определяющие волновые нагрузки. Приведены основные результаты теоретических и экспериментальных исследований по изучению волнового воздействия на трубные элементы конструкций морских нефтегазовых сооружений.
На основе проведенных исследований предложен алгоритм расчета волновых нагрузок, рекомендуемый для первичной оценки напряженно-деформированного состояния в вертикальных сваях морских оснований. Предложенный алгоритм предусматривает последовательное выполнение шагов, который включает расчет орбитального движения частиц жидкости по глубине моря, расчет переносного движения жидкости под воздействием ветровых волн, расчет ускорения частиц жидкости и на заключительном шаге непосредственно оценивается волновое давление на трубчатую сваю. Это давление складывается из скоростного и инерционного составляющих. На выходе реализации

алгоритма строится эпюра волнового давления по вычисленным значениям волнового давления по расчетным шести точкам.
Предложенный алгоритм составлен исходя из физических представлений о формировании ветровых волн и механизма волнового воздействия на трубчатую вертикальную сваю, которые получили подтверждение с достаточной точностью как в лабораторных условиях, так и условиях проведения натурных экспериментов.
На основе вычислительного алгоритма для проведения волнового расчета составлена программа и реализована на компьютере, которая может быть рекомендована для использования при проектировании опорных блоков морских платформ.
**Ключевые слова:** платформа, опорный блок, волновые нагрузки, волновое давление, моделирование

Publication history

Article received: 16.11.2022
Article accepted: 29.11.2022
Article published online: 19.12.2022
DOI suffix: 10.36962/PAHTEI23122022-90

E-ISSN: 2674-5224

97-104 VOLUME 23 ISSUE 12 2022



ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

# STUDY OF RHEOLOGY OF PLANT ORIGIN GUM SOLUTIONS IN DIFFERENT SOLVENT MEDIA

**Nizami Zeynalov[1], Ulviyya Mammedova[2], Shamo Tapdıqov[3], Sevda Fatullayeva[4], Nargiz Rahimli[5], Nigar Shikhverdieva[6], Jamila Guliyeva[7], Aytac Rajabli[8]**

[1,2,4,5,6,7,8]Institute Catalysis and Inorganic Chemistry named after academician M.Naghiyev
[3]SOCAR Oilgasscientificresearchproject Institute
[1]Head of laboratory, Doctor of Chemical Sciences, Email: zeynalovnizami3@gmail.com
[2]Leading researcher, PhD, associate professor, Email: ulviyye_mammadova@mail.ru
[3]Leading researcher, PhD, associate professor, Email: shamo.chem.az@gmail.com
[4] Leading researcher, PhD, associate professor, Email: sevafatullayeva@hotmail.com
[5]Junior Research, Email: narciss.rehim93@mail.ru
[6]Junior Research, Email: nigarshikhverdiyeva@gmail.com
[7]Junior Research, Email: guliyevajamila94@gmail.com
[8]Junior Research, Email: aytac.recebli97@mail.ru

## ABSTRACT

The research work consists of the preparation of solutions of special concentration using biopolymers of gum origin, which are natural polysaccharides with a branched structure, and the study of characteristic properties of solutions used in enhanced oil recovery in the oil industry. Gum solutions of three types collected from young trunks of pine (fir), cherry and acacia trees as gums of plant origin (GPO) biopolymers were used in this research. The collected GPO were purified by cleaning from mechanical impurities and powdered. In general, one of the main requirements to polymer solutions used in enhanced oil recovery by oil displacement is the assessment of their viscosity. Unlike Newtonian fluids, at polymer solutions moving in porous media, macromolecules are stretched and compressed. The change of viscosity of biopolymer solutions depending on ionic strength has been studied in the presented work. Viscosity of solutions of certain concentrations of biopolymers in the presence of salt, inorganic and active surfactant matter (ASM) has been studied. The dependence of viscosity on temperature and electrolyte viscosity under different flow conditions has been studied. It has been shown that viscosity increases with the addition of both salt and anionic active surfactant matter to the fir gum. At the same time, the viscosity of solutions was checked in the presence of ionogenic and non-ionogenic organic substances, their internal and surface tension was compared.
In this regard, the surface and internal tension of all three GPO solutions in the presence of anionic ASM carboxymethylcellulose, have been investigated. It has been established that the surface tension of carboxymethylcellulose is 37.4 mN/m, while its addition to GPO solutions reduces the surface tension of all three biopolymer solutions to 31.8 mN/m. This is due to the formation of intermolecular interactions between macromolecules of biopolymers. For cherry origin biopolymer gum, the effect of the high salt content anion ASM is negligible compared to the salt solution without ASM. When the amount of salt content is high and the anion ASM is present at low solids from carboxymethylcellulose , no change in viscosity is observed compared to the without ASM solution. So, when the amount of anion ASM concentration is higher than carboxymethylcellulose , a slight increase in viscosity is observed compared to a polymer solution without ASM. On the other hand, for carboxymethylcellulose, the viscosity increases with the addition of both the salt and the anionic ASM, which leads to a further increase in viscosity. As a

result of the research, it was determined that if the surface tension of the carboxymethylcellulose value is equal to the recorded above, its addition to GPO solutions reduces the surface tension of all three biopolymer solutions. This is due to the formation of intermolecular interactions between the macromolecules of carboxymethylcellulose and GPO biopolymers. The mixture of fir gum with carboxymethylcellulose slightly increases the internal tension, which is due to the chemical composition and characteristic physical properties of that gum. Based on the research results, the biopolymer solutions were prepared by using the proposed gums of plant origin, and the possibility of their use in compaction of viscous liquids in the pores of rocks was confirmed. The nature of biopolymer solutions leads to a decrease in viscosity values, internal and external surface tension during mixing with different ionic strength or contact with organic matter solution. This reduction would have increased their application capacity as compression fluid.
**Keywords:** gum of plant origin, biopolymer, viscosity, surface and internal tension

## BİTKİ MƏNŞƏLİ KİTRƏ MƏHLULLARININ MÜXTƏLİF HƏLLEDİCİ MÜHİTLƏRİNDƏ REOLOGİYASININ TƏDQİQİ

**Nizami Zeynalov[1], Ülviyyə Məmmədova[2], Şamo Tapdıqov[3], Sevda Fatullayeva[4], Nərgiz Rəhimli[5], Nigar Şixverdiyeva[6], Cəmilə Quliyeva[7], Aytac Rəcəbli[8]**
[1,2,4,5,6,7,8]Akademik M.Nağıyev adına.Kataliz və Qeyri-üzvi Kimya İnstitutu
[3]SOCAR Neftqazelmitədqiqatlayihə İnstitutu
[1]Laboratoriya müdiri,Kimya elmləri doktoru, Email: zeynalovnizami3@gmail.com
[2] Aparıcı elmi işçi, Kimya üzrə fəlsəfə elmlər doktoru, dosent, Email: ulviyye_mammadova@mail.ru
[3] Aparıcı elmi işçi, Kimya üzrə fəlsəfə elmlər doktoru, dosent, Email: shamo.chem.az@gmail.com
[4] Aparıcı elmi işçi, Kimya üzrə fəlsəfə elmlər doktoru, dosent, Email; sevafatullayeva@hotmail.com
[5]Kiçik elmi işçi, Email: narciss.rehim93@mail.ru
[6] Kiçik elmi işçi, Email: nigarshikhverdiyeva@gmail.com
[7]Kiçik elmi işçi, Email: guliyevajamila94@gmail.com
[8]Kiçik elmi işçi, Email: aytac.recebli97@mail.ru

### XÜLASƏ

İşdə bitki mənşəli kitrə biopolimerləri (BMK) kimi üç tip – şam (küknar), albalı və akasiya ağaclarının cavan gövdələrindən toplanan qətran məhlullarından istifadə olunmuşdur. Yığılmış BMK-lər mexaniki qarışıqlardan təmizənərək saflaşdırılmış və toz halına salınmışdır. Biopolimerlərin müəyyən qatılıqlı məhlullarının duz, qeyri-üzvi və səthi aktiv maddə iştirakında özlülükləri tədqiq edilmişdir. Müxtəlif axın şəraitində özlülüyün temperatur və elektrolit qatılığından asılılığı öyrənilmişdir. Göstərilmişdir ki, küknar mənşəli BMK məhluluna həm duzun, həm də anion səthi aktiv maddənin əlavə edilməsi ilə özlülük artır. Anion səthi aktiv maddə olan karboksimetilsellüloza iştirakında hər üç BMK məhlullarının müəyyən qatılıqlarında səthi və daxili gərilmələri tədqiq olunmuşdur. Müəyyən edilmişdir ki, karboksimetilsellülozanın səthi gərilməsi 37.4 mN/m olduğu halda onun BMK məhlullarına əlavə edilməsi hər üç biopolimer məhlulunun səthi gərilməsi 31.8 mN/m-ə qədər azaldır. Bu biopolimerlərin makromolekulları arasında intermolekulyar qarşılıqlı əlaqələrin əmələ gəlməsi ilə əlaqədardır.





**Açar sözlər:** bitki mənşəli kitrə, biopolimer, özlülük, səthi və daxili gərilmə

**Giriş**

Lay təzyiqi aşağı düşmüş neft yataqlarında neftverimini artırmaq üçün istifadə ediləcək mənbəyi bol olan yeni kitrə biopolimer məhlullarının hazırlanması son dövrlərin aktual məsələlərindən biri kimi tədqiqatçıların marağını cəlb edən sahələrdəndir. Məlumdur ki, istismar müddəti ötmüş quyularda lay təzyiqinin aşağı düşməsi məhsuldarlığı azaltmaqla bərabər əlavə texnoloji tədbirlərin də görülməsini tələb edir. Bu məqsədlə müasir neft-qaz sənayesində kənar quyular vasitəsilə neftin həm sıxışdırılması, həm də lay təzyiqinin saxlanılması üçün müxtəlif özlü məhlullardan istifadə olunur. Sintetik və təbii polimerlərin xüsusiyyətlərini nəzərə alaraq Respublikamızda asan əldə oluna bilən, təbii ehtiyyatları bol olan müxtəlif bitkilərin kitrələrindən istifadə etməklə özlü biopolimer məhlullarının hazırlanması və onların gələcəkdə basıcı quyularda istifadə şərtlərini nəzərə alaraq bəzi parametrlərinin tədqiqi təqdim edilən işdə nəzərdə tutulmuşdur. Belə ki, fərqli bitkilərdən toplanan bipolimer kitrələrin müxtəlif qatılıqlı məhlullarının dinamik özlülüyünün temperatur və saxlanılma müddətindən, eləcə də qarışdırılacaq suyun mineraloji tərkibindən asılılığı öyrənilmişdir. Bundan savayı şaxəli struktura malik təbii polisaxarid olan kitrə mənşəli biopolimerlərdən istifadə edərək xüsusi qatılıqlı məhlulların hazırlanması və neft sənayesində neftveriminin artırılmasında istifadə edilən məhlullara xarakterik xassələrinin tədqiqi aparılmışdır. Bununla əlaqədar biopolimer məhlullarının özlülüklərinin ion gücündən asılı olaraq dəyişilməsi öyrənilmişdir. Həmçinin məhlulların özlülüyü ionogen və qeyri-ionogen üzvi maddələr iştirakında yoxlanılmış, daxili və səthi gərilmələri müqayisə edilmişdir.

**Məqsəd**

**Problemin aktuallığı və əlaqəli tədqiqatlar.** Əksər neft yataqlarında lay təzyiqini saxlamaq və nefti hasilat quyularına sıxışdırmaq üçün dəniz və müxtəlif əlavəli şirin su yeraltı lay süxurlarına vurulur. Bu əməliyyat su basması adlanır. Tədqiqatçılar quyularda neft verimini artırmaq (QNA) üçün müxtəlif üsullar işləyib hazırlamışlar. Bunlara termal, kimyəvi və qaz vurulması və s. üsulları aiddir [1,2]. Polimer axınları –"Polymer flood" ən çox istifadə edilən kimyəvi QNA üsuludur. Suya polimerlərin əlavə edilməsi nəticəsində su-yağ hərəkətliliyi azalır. Belə bir dəyişiklik daha yaxşı süpürmə səmərəliliyinə səbəb ola bilər [3]. Polimer axınları bütün dünyada bir çox QNA layihələrində texniki və iqtisadi cəhətdən uğurlu olmuşdur [4]. Sahə tətbiqlərində polimer axınları ilə QNA-nı 12-15% artırmaq mümkündür [5]. Təcrübələr göstərdi ki, neft hasilatının artırılması üçün adi suyun əvəzinə polimer məhlullarının vurulması xərclərin azalması nöqteyi-nəzərdən səmərəlidir [6].

Ümumiyyətlə neftin sıxışdırılması ilə neftveriminin artırılmasında istifadə olunan polimer məhlullarına qoyulan əsas tələblərdən biri onların özlülük qiymətləridir. Nyuton mayelərdən fərqli olaraq polimer məhlullarının məsaməli mühitlərdə hərəkəti zamanı makromolekulların dartılması və sıxılması baş verir. Belə halda, polimerlər əlavə özlü elastiklik nümayiş etdirirlər ki, bu da mikroskopik və makroskopik sürüşmə effektliyi yaradır [7-9]. Müxtəlif molekul kütlə paylanmasına malik eyni orta molekul kütləli polimer məhlulları oxşar axın özlülüyündə fərqli elastiklik formalaşdırırlar. Tədqiqatlara əsasən yüksək elastikli polimer məhlullar məsaməli mühit daxilində axmağa qarşı daha yaxşı müqavimət göstərir. Bu isə sonda aşağı qalıq neft doymasına və neftveriminin yaxşılaşmasına gətirib çıxarır [10].

ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL
E-ISSN: 2674-5224
VOLUME 23 ISSUE 12 2022

**Metodlar**

Uyğun ağacların gövdələrindən xam maddə olan kitrələr yığıldıqdan sonra maqnit qarışdırıcının köməyi ilə təmiz suda 2 gün ərzində tam həll edilmiş və süzülərək mexaniki hissələrdən təmizlənmişdir. Sonra məhlullar 3 gün ərzində 30°C-də qarışdırılaraq qatılaşdırılıb və spirtdə çökdürülərək qurudulub toz halına salınır. Fazalararası gərilmə təcrübələri üçün Sigma-Aldrich-dən dodekan alınmışdır. Səthi aktiv maddənin (SAM) 32%-ni aktiv maddə (AM) təşkil edir. Həm təmiz, həm də durulaşdırılmış SAM istifadə edilmiş; durulaşdırma ultratəmiz su ilə aparılmışdır. Tween® 80, qeyri-ion SAM, Sigma-Aldrich-dən alınmışdır. Biopolimer məhlullarının səthi və fazalararası gərilmə otaq temperaturu şəraitində (20±1°C) Sigma 703 halqa tenziometrindən istifadə etməklə ölçülmüşdür. Tenziometr ultra təmiz su ilə kalibrlənmişdir. Arzuolunmaz artefaktları minimuma endirmək üçün platin halqə əvvəlcə yuyucu vasitə, su və daha sonra alovla təmizlənir. Şüşə qablar əvvəlcə su, aseton və toluol ilə təmizlənmiş, sonda isə təmiz su ilə yuyulmuşdur. Ölçmələr üçün 20 ml polimer məhlulu saxlayan kiçik şüşə qab istifadə edilmişdir. Fazalararası gərilmənin ölçülməsi üçün səthə 20 ml dodekan əlavə edilmişdir. Səthi gərilmənin qiymətlərinin, səthi gərilmənin müşahidə olunan azalması 1 saat ərzində 1 mN/m olanadək ölçülməsi aparılmışdır.

Əvvəlki tədqiqatda üç fərqli bitki mənşəli kitrə (küknar, albalı və akasiya) biopolimerlərindən istifadə etməklə suda və lay suyunda özlülüyü müəyyən edilmiş və şirin/lay suyunda dinamik və kinematik özlülükləri, eləcə də bu özlülüklərin BMK-in miqdarından, temperaturdan və məhlulların qalma müddətindən asılılıqları öyrənilmişdir [11].

Küknar mənşəli kitrə biopolimeri (KMB) elektrolitlərin kiçik qatılıqlarına həsasslıq göstərməyən neytral biopolimerdir [12]. Məhlulda KMB zəncirləri çubuqşəkilli üçlü spirallar əmələ gətirir, onların aqreqasiyasının qarşısı D-qlükozidamid qrupları tərəfindən alınır. KMB-nın aşağı duz/SAM qatılıqlarında, 50°C-də özlülüyü öyrənilmiş və müxtəlif axın qiymətlərində özlülüyü şəkil 1-də verilmişdir.




**Şəkil 1.** Kiçik qatılıqlı duz və SAM qatılığının 50°C-də KMB-nin özlülüyünə təsiri

Tədqiq edilmiş bütün temperaturlarda duz və ya SAM əlavə edilməsi ilə özlülük artır. Əlavə edilən duzun kiçik miqdarlarında, özlülüyün cüzi (demək olar ki, əhəmiyyətsiz dərəcədə) artımı müşahidə olunur. Duz və ion SAM orta qatılıqlarında əlavəsi zamanı məhlulun özlülüyün artması





baş verir [13]. KMB məhlulunun özlülüyünün artırılmasında qeyri-ion SAM ən böyük aktivlik nümayiş etdirir. Bu müşahidə qeyri-qlükan molekulların (1,3)-β-D-qlükanların daxilində əmələ gələn birölçülü hidrofob boşluqda tutula bilməsi ilə izah edilə bilər [14]. Anion SAM-ı istifadə edərkən, məhlulun özlülüyü SAM-ın bağlanması səbəbindən artır və polimer daha uzun bir konformasiyaya malik polielektrolitə çevrilə bilir. Belə ki, ölçülmüş özlülüyün yerdəyişməsinin qismən yüksək sürətli sürüşmə rejiminə çevrilməsi faktı, özlülüyün artması təbiətinə görə qismən qeyri-elektrostatik xarakter daşıdığının bariz göstəricisidir [13].
KMB albalı kitrəsindən daha az termohəssasdır, bu da üçlü spiralın ərimə temperaturunun ~135°C olması ilə əlaqədardır; beləliklə, denaturasiya ~135°C-dən aşağı baş vermir və spiral quruluşu qorunub saxlanılır. Şəkil 1-də göstərilən tendensiyalar bütün qatılıqlarda, temperaturlarda müşahidə edilərək elektrolit və temperaturun KMB-yə təsirinin minimal olduğunu təsdiqləyir. Əlaqəli SAM ilə KMB-nin hidrodinamik həcminin artması istiqamətinin uyğunluğu KMB üçün ölçülmüş özlülüyün bütün artımlarının qismən yüksək sürüşmə sürəti rejiminə çevrilməsi ilə əlaqədardır. Qeyri-ion SAM-ın aşağı qatılıqlarında özlülüyün sabit artımının miqyasına görə, digər qeyri-elektrostatik mexanizmlər də hidrodinamik kütləvi təsirlərə əlavə olaraq özlülüyün artımını izah edə bilər [13-15]. Bütün əlverişli xüsusiyyətlər, o cümlədən yüksək termiki, sürüşməyə və duza davamlılıq, eləcə də səthi aktiv maddənin iştirakı ilə artan özlülük, KMB-nin QNA-da polimer ilə sıxışdırma üçün perspektivli material olduğunu nümayiş etdirir [16]. Belə ki, anion səthi aktiv maddənin duz məhluluna təsiri albalı kitrəsi ilə KMB üçün fərqlidir (şək.2).




**Şəkil 2.** 1.5 qr/l KMB və 3 qr/l qatılıqlı AMB-nin 25°C-də özlülüyünə duz və anion səthi aktiv maddə qatılıqlılarının təsiri

Albalı mənşəli biopolimer (AMB) kitrəsi üçün duzun yüksək miqdarında anion SAM-ın təsiri, səthi aktiv maddə olmayan duz məhlulu ilə müqayisədə əhəmiyyətsizdir. Duzun miqdarı yüksək olduqda (3,5 kütlə %), hansı ki, anion SAM karboksimetilsellülozadan (KMS) aşağı qatılıqlarda mövcud olduqda, səthi aktiv maddə olmayan məhlulla müqayisədə özlülükdə heç bir dəyişiklik müşahidə edilmir. Belə ki, anion SAM-ın miqdarı KMS-dən yuxarı qatılıqlarda mövcud olduqda, səthi aktiv maddə olmayan polimer məhlulu ilə müqayisədə özlülükdə bir qədər artım müşahidə olunur. Digər tərəfdən, KMB üçün, həm duzun, həm də anion səthi aktiv maddənin əlavə edilməsi ilə özlülük artır, bu da özlülüyün daha da artmasına səbəb olur.
Müşahidə olunan özlülüyün əhəmiyyətli dərəcədə artması anion SAM-ın olmasını tələb edir, lakin

o, anion səthi aktiv maddənin qatılığından asılı deyil. Belə ki, elektrostatik qarşılıqlı təsir NaCl-un 3,5% kütlə nisbətində ekranlaşdığından, viskozlaşma mexanizminin elektrostatik spiralın burulmasının genişlənməsini ehtiva etməsi ehtimalı azdır [15]. Əksinə, özlülüyün artmasına görə çox güman ki, qeyri-elektrostatik təsir qüvvələri cavabdehdir və bunu üç şərt sübut edir:
-qeyri-ion SAM-ın qatılıqdan asılılığının olmaması, hansı ki, elektrostatik effektlərə nisbətən qeyri-elektrostatik effektlərlə daha çox əlaqəlidir;
-elektrostatik effektdən fərqli olaraq qeyri-elektrostatik effekti olan ekranlaşdırılmış mühit;
-ekranlaşma mühiti.
Anion SAM olan KMS iştirakında hər üç BMK-nın müəyyən qatılıqlı məhlullarının səthi və daxili gərilməsi tədqiq olunmuş və nəticələr cədvəl 1-də verilmişdir.

**Cədvəl 1.** Anion SAM – KMS və eləcə də onun küknar, akasiya və albalı mənşəli kitrələr ilə birlikdə böhran miselyar qatılıqlarda səthi və daxili gərilmələri.

| Nümunələr | Səthi gərilmə | | Daxili gərilmə | |
|---|---|---|---|---|
| | KMS mol/L | γKMS mN/m | KMS mol/L | γKMS mN/m |
| Anionit KMS | 5.02×10-4 | 37.4 | 2.82×10-4 | 6.8 |
| Küknar qətranı+KMS | 9.14×10-4 | 35.7 | 8.25×10-4 | 7.4 |
| Akasiya qətranı+KMS | 8.73×10-4 | 33.5 | 8.73×10-4 | 5.2 |
| Albalı qətranı+KMS | 7.85×10-4 | 31.8 | 8.86×10-4 | 5.1 |

**Nəticə**

Müəyyən olunmuşdur ki, KMS-nin özünün səth gərilməsi 37.4 mN/m olduğu halda onun BMK məhlullarına əlavə edilməsi hər üç biopolimer məhlulunun səthi gərilməsini azaldır. Bu KMS ilə BMK biopolimerlərinin makromolekulları arasında intermolekulyar qarşılıqlı əlaqələrin əmələ gəlməsi ilə əlaqədardır. Daxili gərilmə isə yalnız küknar qətranı ilə KMS qarışığında bir qədər artır ki, bu da həmin kitrənin kimyəvi tərkibi və xarakterik fiziki xassələri ilə bağlıdır.
Əldə edilən nəticələrə əsasən təklif edilən üç tip bitki mənşəli kitrələrdən istifadə etməklə, müxtəlif qatılıqlı biopolimer məhlulları hazırlanmış və onların özlü mayelərin süxur məsamələrində sıxışdırılmasında istifadəsinin mümkünlüyü sübut olunmuşdur. Belə ki, həmin biopolimer məhlullarının təbiəti fərqli ion gücünə və ya üzvi maddə məhlulu ilə təmasında qarışdırılması zamanı özlülük qiymətlərinin, daxili və xarici səthi gərilmənin azalmasına səbəb olur. Bu azalma isə onların sıxışdırma mayesi kimi tətbiq imkanlarını artırmış olur.

**Bu iş SOCAR-ın maliyyə yardımı ilə yerinə yetirilmişdir – Qrant LR№11 “Neft yataqlarının neftveriminin artırılması üçün yeni bitki mənşəli kitrə-biopolimer “nanomayelərin” yaradılması”**

## ƏDƏBİYYAT

1. YaserAhmadi, MajidMohammadi, MehdiSedighi. Introduction to chemical enhanced oil recovery. Chemical Methods, Enhanced Oil Recovery Series, 2022, Pages 1-32.
2. Silva, I.; Aguiar, A.; Rezende, V.; Monsores, A.; Lucas, E. A polymer flooding mechanism for mature oil fields: Laboratory measurements and field results interpretation. J. Pet. Sci. Eng. 2018, 161, 468–475.




3. Kamal, M.S., Sultan, A.S., Al-Mubaiyedh, U.A., Hussein, I.A.: Review on polymer flooding: rheology, adsorption, stability, and field applications of various polymer systems. Polym. Rev. 55, 491–530 (2015).
4. Gbadamosi, A.O., Junin, R., Manan, M.A., Yekeen, N., Augustine, A.: Hybrid suspension of polymer and nanoparticles for enhanced oil recovery. Polym. Bull. (2019).
5. Olajire, A.A.: Review of ASP EOR (alkaline surfactant polymer enhanced oil recovery) technology in the petroleum industry: prospects and challenges. Energy 77, 963–982 (2014).
6. Gbadamosi, A.; Junin, R.; Manan, M.; Agi, A.; Yusu_, A. An overview of chemical enhanced oil recovery: Recent advances and prospects. Int. Nano Lett. 2019, 9, 171–202
7. Peng Zhang,Wenzhe Wang,Yingfang Zhou,Gang Ruan,Haiyang Yu &Wenjuan Ji\Preparation and solution properties of a novel cationic hydrophobically modified polyacrylamide for enhanced oil recovery\Pages 764-769, Published online: 17 Feb 2019.
8. Sun, X., Zhang, Y., Chen, G., Gai, Z.: Application of nanoparticles in enhanced oil recovery: a critical review of recent progress. Energies 10, 345 (2017).
9. Silva, I.; Aguiar, A.; Rezende, V.; Monsores, A.; Lucas, E. A polymer flooding mechanism for mature oil fields: Laboratory measurements and field results interpretation. J. Pet. Sci. Eng. 2018, 161, 468–475.
10. Chang W.J., AL-Obaidi S.H., Patkin A.A.\ The Use Of Oil-Soluble Polymers To Enhance Oil Recovery In Hard To Recover Hydrocarbons Reserves\ International Research Journal of Modernization in Engineering Technology and Science Volume:03/Issue:01/January-2021.
11. Mammadova U.A, Fatullayeva S.S, Tapdıqov S.Z, Rahimli N.T, Shikverdieva N.T, Guliyeva J.E,Rajabli A.R. THE USE OF XANTHAN GUM BIOPOLYMER FOR ENHANCED OIL RECOVERY- Scientific Collection "İnterconf" Proceedings of the 1st International Scientific and Practical Conference. Modern directions and movements in science, Luxembourg, Luxembourg. № 127, October 6-8, 2022, page 226-229.
12. Mammadova U.A,Fatullayeva S.S,Tapdıqov S.Z,Rahimli N.T,Shikverdieva N.T,Guliyeva J.E,Rajabli A.R. Industrially important biopolymers-Cukurova 9th International Scientific Researches Conference, Adana-Turkey, October 9-11, 2022.
13. Steffen Berg, John van Wunnik.\ Shear Rate Determination from Pore-Scale Flow Fields.\ Transp Porous Med (2017) 117:229–246, DOI 10.1007/s11242-017-0830-3.
14. Miroslav Veverkaa , Tibor Dubajb,, Eva Veverkovác , Peter Simonb. Natural oil emulsions stabilized by β-glucan gel/Colloids and Surfaces A: Physicochemical and Engineering Aspects https://doi.org/10.1016/j.colsurfa.2017.10.043.
15. Fernandez, I, Moakes, R & Norton, I 2014, 'Designing biopolymer fluid gels : a microstructural approach', Food Hydrocolloids, vol. 42, no. 3, pp. 362-72. https://doi.org/10.1016/j.foodhyd.2014.03.014.
16. Kamal, M.S., Sultan, A.S., Al-Mubaiyedh, U.A., Hussein, I.A.: Review on polymer flooding: rheology, adsorption, stability, and field applications of various polymer systems. Polym. Rev. 55,491–530 (2015).


ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

E-ISSN: 2674-5224

VOLUME 23 ISSUE 12 2022

# ИССЛЕДОВАНИЕ РЕОЛОГИИ КАМЕДИСТЫХ РАСТВОРОВ РАСТИТЕЛЬНОГО ПРОИСХОЖДЕНИЯ В СРЕДАХ РАЗЛИЧНЫХ РАСТВОРИТЕЛЕЙ

**Н.А. Зейналов[1], У.А. Мамедова[1], Ш.З. Тапдыгов[2]*, С.С. Фатуллаева[1], Н.Т. Рагимли[1], Н.Т. Шихвердиева[1], Ч.Э. Гулиева[1], А.Р. Раджабли[1]**

[1245678]Институт Катализа и Неорганической Химии имени академика М.Нагиева

[3] Научно-исследовательский и проектный Институт нефти и газа ГНКАР

[1] Заведующий лабораторией, доктор химических наук , zeynalovnizami3@gmail.com

[2] Ведущий научный сотрудник, доктор философии по химии, доцент, ulviyye_mammadova@mail.ru

[3] Ведущий научный сотрудник, доктор философии по химии, доцент, shamo.chem.az@gmail.com

[4] Ведущий научный сотрудник, доктор философии по химии, доцент, sevafatullayeva@hotmail.com

[5] Младщий научный сотрудник, narciss.rehim93@mail.ru

[6] Младщий научный сотрудник, nigarshikhverdiyeva@gmail.com

[7] Младщий научный сотрудник, guliyevajamila94@gmail.com

[8] Младщий научный сотрудник, aytac.recebli97@mail.ru

## РЕЗЮМЕ

В качестве камедистых биополимеров растительного происхождения (КРП) в работе использовали растворы смол, собранные с молодых стволов трех деревьев - сосны (пихты), вишни и акации. Собранные КРП были очищены от механических примесей и измельчены в порошок. Были изучены вязкости растворов биополимеров определенных концентраций в присутствии солей, неорганических и поверхностно-активных веществ. Исследована зависимость вязкости от температуры и концентрации электролита при различных режимах потока. Было показано, что при добавлении в раствор КРП пихтового происхождения, как соли, так и анионного поверхностно-активного вещества, вязкость увеличивается. Было изучено поверхностное и внутреннее напряжение всех трех растворов КРП определенных концентраций в присутствии карбоксиметилцеллюлозы - анионного ПАВ. Было установлено, что при добавлении карбоксиметилцеллюлозы, имеющей собственное поверхностное напряжение 37,4 мН/м, к растворам КРП поверхностное напряжение всех трех растворов биополимеров снижается до 31,8 мН/м. Это связано с образованием межмолекулярных взаимодействий между макромолекулами биополимеров.

**Ключевые слова:** камедь растительного происхождения, биополимер, вязкость, поверхностное и внутреннее напряжение.

Publication history

Article received: 15.11.2022
Article accepted: 30.11.2022
Article published online: 19.12.2022
DOI suffix: 10.36962/PAHTEI23122022-97

E-ISSN: 2674-5224
105-112 VOLUME 23 ISSUE 12 2022

ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

# M-14B2 MOTOR OIL USED IN SHIP, LOCOMOTIVE, STATIONARY, INDUSTRIAL AND SELF-LOADING DIESELS

**Haqikat Javadova[1], Narmina Aliyeva[2], Gulshan Yusifzade[3], Aida Yusifova[4]**
[1,3,4] "Lubricant compositions" laboratory, [1,3,4]Academician of the Ministry of Science and Education of the Republic of Azerbaijan Ali Guliyev Institute of Chemistry of Additives.
[1]Head of the "Lubricant Compositions" laboratory, professor, Email: lab_djavadova@mail.ru, https://orcid.org/0000-0003-1483-7330
[2]Head of the Department of Petrochemical Technology and Industrial Ecology, ASOIU, candidate of technical sciences, associate professor, Email: narmina13.72@mail.ru, https://orcid.org/0000-0003-1181-466X
[3]Scientific worker, Email: gulshan.yusifzadeh@mail.ru https://orcid.org/0000-0002-0957-1913
[4]Scientific worker of laboratory, Email: aidayusifova@mail.ru, https://orcid.org/0000-0002-8656-9307

## ABSTRACT

M-14B2 motor oil used in diesel locomotives, ships and stationary ДН and ДРН 23/30 brands, as well as large self-loading and industrial 6-8 ЧН 21/21 brand diesels M-14 base oil and 3% ЦИАТИМ-339, 6 % ПМС «А», 2% ВНИИ НП-354 or ДФ-11 and 0.003% ПМС-200А were produced in different cities of Russia. Currently, this oil is sold under different names Lukoil M-14B2, WEGO M-14B2, Rosneft M-14B2, etc. by the Russian company "Oils and Lubricants LLC". is produced.
Since M-14B2 motor oil is widely used in various heavy tonnage machines and mechanisms in the Republic, it is urgent to create a new analogue of this motor oil based on distilled oils obtained from Azerbaijani oils.
Research works on the creation of new lubricant compositions of M-14B2 motor oil are reflected in the article. Researches were carried out in two directions: on the basis of M-11 base oil prepared from the compound of M-8 and M-15 Baku distillate oils, and also using the regeneration product of used motor oils as base oil.
Since the viscosity-temperature properties of Baku base oils do not meet the requirements of group B2 motor oils (the viscosity index of Baku base oils is 70-75 units while the standard viscosity index is 75-80), in order to involve them in lubricant compositions, it is first necessary to improve the viscosity-temperature properties was being For this, a number of polymethacrylate-type Viscoplex series additives of the German company Evonik were used as the research object. In the selection of additives, their resistance to mechanical and thermal destruction was taken into account.Thus, M-11 base oil made from the compound of M-8 and M-15 Ba ku distillate oils, additives with different functional properties - detergent-dispersant - succinimide type OLOA-373c, detergent-dispersant - C-150, against oxidation, corrosion and corrosion - By researching Mx-3103, Viscoplex-4-550 viscosity additives, M-14B2 lubricant composition was created in accordance with the requirements of GOST 12337.
As a result, a new analogue of M-14B2 API CB SAE 40 brand oil was created using additives with different functional properties taken in different concentrations.Research on the creation of new lubricant compositions was also created using the regeneration product of used oils as a base oil. As a result of the research conducted by us, the positive quality indicators of the regeneration product of Mysella-40 motor oil used for 6000 hours in the spark-burning generator of Modular Power Stations have confirmed its use as a base oil.

On the basis of the regeneration product, together with the additive packages SAN-2022A, OLOA-9999, PA-2600, the multifunctional additive synthesized at the institute - the calcium salt of the condensation product of alkylphenol with formaldehyde and aminoacetic acid AKI-150, the zinc salt of dialkylithiophosphate acid against oxidation and corrosion ДФ-11 and from the laboratory tests of the created additive composition consisting of detergent-dispersant C-250 additives, it is clear that the lubricant compositions fully meet the requirements set for the analogous commodity oil sample.
Thus, the new M-14B2 API CB SAE 40 type lubricant compositions created by using the regeneration product of the spent sample of M-11 and Mysella-40 oil made of the compound of Baku distillate oils as base oils, according to their physical-chemical and operational properties, are suitable for ships, locomotives, industry, heavy, it is recommended for use because it is ecologically and economically efficient, in addition to fully meeting the requirements of GOST 12337 for its use in ДН and ДРН 23/30 diesels that discharge its own load (6-8 ЧН 21/21).
**Keywords:** base oil, motor oil, regeneration product, lubricant composition, additive, additive package.

## M-14B$_2$ API CB SAE 40 TIPLI MOTOR YAĞININ YENI SÜRTKÜ KOMPOZISIYALARI

**Həqiqət Cavadova[1], Nərminə Əliyeva[2], Gülşən Yusifzadə[3], Aidə Yusifova[4]**
[1,3,4] “Sürtkü kompozisiyaları” laboratoriyası, [1,3,4]Azərbaycan Respublikasının Elm və Təhsil Nazirliyinin akad. Əli Quliyev ad. Aşqarlar Kimyası İnstitutu
[1]“Sürtkü kompozisiyaları” laboratoriyasının müdiri, texnika elmləri doktoru, professor,
Email: lab_djavadova@mail.ru, https://orcid.org/0000-0003-1483-7330
[2]ADNSU, “Neft-kimya texnologiyası və sənaye ekologiyası” kafedrasının müdiri,texnika elmləri namizədi, dosent,
Email : narmina13.72@mail.ru, https://orcid.org/0000-0003-1181-466X
[3]elmi işçi, e-mail: gulshan.yusifzadeh@mail.ru, https://orcid.org/0000-0002-0957-1913
[4]elmi işçi, e-mail: aidayusifova@mail.ru, https://orcid.org/0000-0002-8656-9307

### XÜLASƏ

M-14B$_2$ motor yağı gəmi, teplovoz, stasionar, sənaye və öz yükünü boşaldan dizellərində istifadə edilir.
Respublikada M-14B$_2$ motor yağı müxtəlif ağır tonnajlı maşın və mexanizmlərdə geniş həcmdə istifadə edildiyinə görə bu motor yağının yeni analoqunun Azərbaycan neftlərindən alınan distillə yağları əsasında yaradılmasını aktual edir.
Məqalədə M-14B$_2$ motor yağının yeni sürtgü kompozisiyalarının yaradılması üzrə tədqiqat işləri öz əksini tapmışdır. Tədqiqatlar iki istiqamətdə: M-8 və M-15 Bakı distillə yağlarının kompaundundan hazırlanmış M-11 baza yağı əsasında, və həmçinin işlənmiş motor yağlarının regenerasiya məhsulundan baza yağı kimi istifadə etməklə aparılmışdır.
Nəticədə müxtəlif qatılıqlarda götürülmüş oksidləşmə, korroziya, yeyeilməyə qarşı, detergtent-dispersedici, yuyucu-dispersləşdirici və s. funksional xassələrə malik aşqarlardan istifadə etməklə M-14B$_2$ API CB SAE 40 markalı yağının yeni analoqları yaradılmışdır.




Yaradılan yeni sürtgü kompozisiyasları fiziki-kimyəvi və istismar xassələrinə görə gəmi, teplovoz, sənaye, iriyüklü, öz yükünü boşaldan (6-8 ЧН 21/21), habelə ДН və ДРН 23/30 markalı dizellərdə istifadəsi üçün qoyulan ГОСТ 12337 tələblərinə tam cavab verir və tətbiq üçün tövsiyə edilir.
**Açar sözlər:** baza yağı, motor yağı, regenerasya məhsulu, sürtgü kompozisiyası, aşqar, aşqar paketi.

**Giriş**

Teplovoz, gəmi və stasionar ДН və ДРН 23/30 markalı dizellərdə, həmçinin iriyüklü öz yükünü boşaldan və sənaye 6-8 ЧН 21/21 markalı dizellərdə istifadə edilən M-14$B_2$ motor yağı ilk dəfə 1984-cü ildə M-14 baza yağı və 3% ЦИАТИМ-339, 6% ПМС «А», 2% ВНИИ НП-354 və ya ДФ-11 və 0,003% ПМС-200А aşqarlarının istifadəsi ilə Rusiyanın müxtəlif şəhərlərində istehsal olunmuşdur. [1]. Hal hazırda Rusiyanın "Oils and Lubricants" LLC şirkəti tərəfindən həmin yağ müxtəlif adlarda Lukoyl M-14$B_2$, WEGO M-14$B_2$, Rosneft M-14$B_2$ və s. istehsal olunur.

**Məqsəd**

Respublikada M-14$B_2$ motor yağı müxtəlif ağır tonnajlı maşın və mexanizmlərdə geniş həcmdə istifadə edildiyinə görə bu motor yağının yeni analoqunun Azərbaycan neftlərindən alınan distillə yağları əsasında yaradılmasını aktual etmişdir.
M-8 və M-15 Bakı distillə yağlarının kompaundundan hazırlanmış M-11 baza yağı və oksidləşmə, korroziya, yuyuculuq və s. müxtəlif funksional xassələrə malik aşqar kimi detergtent-dispersiyaedici – suksinimid tipli OLOA-373c, yuyucu-dispersləşdirici C-150, oksidləşmə, korroziya və yeyeilməyə qarşı – Mx-3103. Mx-3104 aşqarlarının tədqiqi ilə ГОСТ 12337 tələblərinə uyğun M-14$B_2$ sürtgü kompozisiyası yaradılmışdır. [2]

**Cədvəl 1**. M-14$B_2$ markalı motor yağının yeni analoqunun əsas keyfiyyət göstəriciləri.

| Göstəricilər | M-14$B_2$ motor yağı ГОСТ 12337-84 | M-11 Bakı baza yağı 2,4% Viscoplex-4-550 4,2% C-150 2,2% OLOA-373c 0,8% Mx-3103 0,5% Viscoplex 5-309 0,003% ПМС-200А |
|---|---|---|
| Kinematik özlülük, $mm^2/s$, 100 $^0C$ | 13,0-14,5 | 13,78 |
| Özlülük indeksi, aşağı olmamalı | 85 | 94 |
| Qələvi ədədi mq KOH/1q yağa, aşağı olmamalı | 4,8 | 6,3 |
| Sulfat külünün miqdarı, % | 1,2 | 1,032 |
| Çöküntü əmələ gətirməyin induksiya dövrünə əsasən davamlıq, %, (50 saat) | Davam gətirir | Davam gətirir |
| Korroziyalıq, ГОСТ 377877 üzrə C1 və C2 markalı qurğuşun lövhələrdə, $q/m^2$ | Yoxdur | Yoxdur |
| Donma tempraturu, $^0C$, yuxarı olmamalı | Mənfi 12 | Mənfi 15 |
| Alışma temperaturu açıq putada təyin olunmuş, $^0C$, aşağı olmamalı | 210 | 230 |

keçid müddəti ilə xarakterizə olunan idarəetmə prosesinin keyfiyyətinin az olmasına səbəb olur.Hazırkı məqalədə də qaraciyər xərçəngi kimi tanınan hepatosellular karsinomanın (HSK) ilkin diaqnozu və proqnozlaşdırılması üçün intellektual sistemin yaradılması istiqamətində aparılan tədqiqatda maşın təlimi alqoritmlərinin tətbiqi ilə bağlı araşdırmaların nəticələri verilmiş, daha yaxşı nəticə göstərən alqoritmin müəyyənləşdirilməsi üçün aparılmış eksperimentlərin nəticələri təqdim olunmuşdur.

**Məqsəd**

**Problemin aktuallığı və əlaqəli tədqiqatlar.** Bunları nəzərə alaraq, iri materialların nəqlinin texnoloji proseslərində istifadə olunan lentli konveyer intiqalı üçün standart elektrik modeli nümunəsində obyektin qeyri-xətti xassələri nəzərə alınmaqla və lazımi idarəetmə keyfiyyətini təmin etməyə imkan verən PID kontrollerin tənzimləmə parametrlərinin qeyri-səlis adaptasiyası məsələsinin həlli nəzərdən keçirilmişdir. Kontroller kimi proqramlaşdırılan məntiqi kontroller (PMK) Siemens S7-1500 götürülmüşdür. PMK-nın öz kitabxanasında qeyri-səlis kontroller olmadığı üçün onun proqram modelinin realizə edilməsi bəzi özəlliklərə malikdir. Beləliklə, bütün idarəetmə sistemi, o cümlədən obyekt Simulink paketində realizə edilmiş, kontroller isə bu sistemə inteqrasiya edilmiş bir aparat cihazı kimi işlənilir. Belə bir hibrid sistemi realizə etmək üçün PMK kontroller ilə Simulink modeli arasında proqram təminatı əlaqəsini təmin etmək üçün sənaye avtomatlaşdırmasında geniş istifadə olunan Object Linked and Embedded (OLE) for Process Control (OPC) kommunikasiyalarından tətbiq etmək məqsədəuyğundur.
Texnoloji avadanlıqların, proseslərin və sistemlərin artan mürəkkəbliyi şəraitində idarəetmə səmərəliliyinin yüksəldilməsi aktual problemdir. Mürəkkəb obyektlərin idarəetmə sistemlərinin layihələndirilməsi üçün adekvat riyazi və ya simulyasiya modellərinin qurulması və qeyri-müəyyənlik şəraitində problemlərin həllini təmin edən idarəetmə alqoritmlərinin sintezi məsələsinin həlli mühüm rol oynayır.
Qeyri-səlis məntiqin xassələri natamam məlumatların emal edilməsi, insan biliklərini təqlid edərək əsaslandırılmış qərarlar verilməsi ondan texnoloji proseslərin real vaxt rejimində monitorinqində intensiv istifadəni, eləcə də texnoloji proseslərə idarəetmə sistemlərinin praktiki tətbiqi ilə əlaqədar problemlərin həllini mümkün edir [2]. İdarəetmə sistemlərində qeyri-səlis məntiqdən istifadə operatorun idarəetmə prosesinə müdaxilə dərəcəsini azaltmağa və buna görə də sənaye mühitinə daha uyğunlaşdırılmış yeni idarəetmə üsullarının işlənib hazırlamağa imkan verir. Qeyri-səlis məntiqə əsaslanan tənzimləyicilər bəzi hallarda klassik kontrollerlərlə müqayisədə keçid proseslərinin göstəricilərini daha keyfiyyətli olmasını təmin edə bilir. Bundan əlavə, qeyri-səlis idarəetmə alqoritmlərinin sintezi üsullarından istifadə edilməsi kompleks idarəetmə dövrələrini hərtərəfli riyazi tədqiqatlar aparmadan optimallaşdırmağa imkan verir.
Qeyri-səlis məntiqə əsaslanan kontroller ilə PID kontroller arasındakı fərq ondadır ki, kontrollerinin mütənasib inteqrallama dövrəsindəki əmsallar sabit deyil, yəni onlar sistemin cari andakı vəziyyətindən asılıdır. Bu idarəetmə prosesini keyfiyyətcə dəyişməyə, sistemdəki siqnalların parametrlərini (siqnalın dəyişmə sürətini, təcili) nəzərə almağa, həmçinin idarəetmə prosesini daha yaxşı adaptasiya etməyə imkan verir.
Sürət sayğacının PID kontrollerinin əmsallarını hesablamaq üçün, qapalı sistemlərinin parametrik optimallaşdırılması üçün nəzərdə tutulmuş Nonlinear Control Design (NCD) alt proqram paketi (qeyri-xətti idarəetmə sistemlərinin qurulması) ilə Simulink tətbiqi proqramı istifadə olunur. Bu, bərabərsizlik şəklində məhdudiyyətlər daxilində parametrlərin qiymətlərinin optimallaşdırılması

məsələlərini həll etmək üçün proqram təminatı olub, optimallaşdırma alqoritmi kimi ardıcıl kvadrat proqramlaşdırmadan istifadə edilir.

NCD proqram təminatının işi nəticəsində PID kontrollerin əmsalları üçün aşağıdakı qiymətlər alınmışdır:

Kp=3,62; Ki=0,04; Kd=1,05.

Bu sistemdə 0,8% izafi tənzimləmə olduğu müəyyən edilmişdir. Bu işin növbəti mərhələsi lentli konveyerin elektrik intiqalının yuxarıda göstərilən modeli üçün qeyri-səlis məntiq qaydalarına əsaslanan PID kontrollerin yaradılmasıdır. Siemens S7-1500 PMK əsasında qeyri-səlis PID kontrollerin yaradılması prosesi 2 mərhələdə yerinə yetirilir:




**Şəkil 1.** “CONT_C” kontroller bloku

1. “CONT_C” fasiləsiz idarəetmə blokundan istifadə etməklə TIA PORTAL (və ya STEP7) proqram mühitində PID kontrollerin proqramının tərtib edilməsi;
2. LD (Ladder Diagram), FBD (Function Block Diagram) və ya STL (Structured Text Language) proqramlaşdırma dilindən istifadə etməklə TIA PORTAL-da qeyri-səlis PID kontroller proqramının hazırlanması;

"CONT_C" bloku (fasiləsiz kontroller) SIMATIC S7 proqram məntiq kontrollerlərində fasiləsiz giriş və çıxış dəyişənli texniki prosesləri idarə etmək üçün istifadə olunur. Kontroller sabit tapşırıq

qiymətli (SP) PID kontroller və ya çoxdövrəli idarəetmə sistemlərində kaskadlı kontroller, diferensial və ya mütənasib kontroller kimi istifadə edilə bilər. Kontrollerin funksiyaları rəqəmsal kontrollerin analoq siqnal əsasında PID idarəetmə alqoritminə əsaslanır.

Qeyri-səlis kontrollerin əsas funksiyası sistemin cari koordinatlarından asılı olaraq çıxış idarəetmə təsirinin yaradılmasıdır.

Kontrollerə daxil olan məlumatların işlənməsi proseduru aşağıdakı kimi təsvir edilə bilər (şəkil 2):

1) giriş dəyişənlərinin cari qiymətləri linqvistik qiymətlərə çevrilir (fazzifikasiya);

2) alınmış linqvistik qiymətlər əsasında və kontrollerin qaydalar bazasından istifadə etməklə qeyri-səlis məntiqi qərar qəbul edilir, nəticədə çıxış dəyişənlərinin linqvistik qiymətləri hesablanır;

3) Defazzifikasiya nəticəsində səlis qiymətlər hesablanır [3,4].




**Şəkil 2.** Giriş dəyişənlərinin işlənməsi

Qeyri-səlis tənzimləyicinin biliklər bazasının işlənilməsi aşağıdakı məsələlərin həllindən ibarətdir:

1) istənilən hesablanmış rejimdə qapalı idarəetmə sisteminin davranışının təhlili əsasında linqvistik giriş dəyişənlərinin seçimi;

2) linqvistik dəyişənlərinin hər biri üçün linqvistik terminlər toplusunun təyin edilməsi [5];

3) linqvistik dəyişənlərin hər biri üçün təxmini qeyri-səlis çoxluğun seçilməsi.

Şəkil 3-də adi PID kontroller və adaptiv qeyri-səlis PID kontroller blokundan istifadə etməklə Siemens S7-1500 əsasında sistemin modelləşdirilməsi nəticələrinin müqayisəsi göstərilmişdir.




**Şəkil 3.** Keçid proseslərinin müqayisə nəticələri




Klassik PID kontroller və qeyri-səlis kontrollerdən istifadə edərkən prosesin keçid xarakteristikalarını müqayisəsi göstərir ki, qeyri-səlis kontrollerli model üçün izafi tənzimləmənin nəzərəçarpacaq dərəcədə azalması ilə qərarlaşma müddətinin cüzi artımı müşahidə olunur.

**Cədvəl 1.** Sistemin simulyasiya nəticələrinin müqayisəsi.

| | İzafi tənzimləmə, % | Prosesin qərarlaşma müddəti, san. |
|---|---|---|
| PID tənzimləyicisi | 0.8 | 4.8 |
| Qeyri-səlis tənzimləyici | 0.1 | 5.7 |

**Nəticə**

Beləliklə, lentli konveyerinin elektrik intiqalının parametrlərini təshih etmək üçün qeyri-səlis PID kontrollerin layihələndirilməsi üçün qeyri-səlis modelin qurulması zamanı linqvistik dəyişənlərin yaradılması üsulu təklif olunur. Kontrollerin qeyri-səlis biliklər bazasının formalaşdırılması qaydaları, qeyri-səlis məntiqi nəticə çıxarma proqram təminatı işlənib hazırlanmış, Siemens S7-1500 PMK əsasında PID və qeyri-səlis PID kontrollerlər tətbiq edilmişdir. Simulyasiya nəticələri göstərir ki, adaptiv qeyri-səlis PID kontrollerin reaksiyası klassik PID kontrollerindən nisbətən daha yaxşıdır.

**ƏDƏBİYYAT**

1. Bhargava A.K. Fuzzy Set Theory Fuzzy Logic and their Applications.- S. Chand Publishing, 2013. – 373 p.
2. Kenneth Ruth Isabels, Uthra G. An Application of Linguistic Variables in Assignment Problem with Fuzzy Costs. // International Journal of Computational Engineering Research.- 2012, pp.1065-1069.
3. Yusupbekov N.R., Aliev R.A. and other Intelligent control systems and decision making. –Tashkent: "UME", 2014, -490 p.
4. Ian S. Shaw. Fuzzy Control of Industrial Systems: Theory and Applications. -Springer, 2013, -220 p.
5. Richard C. Dorf, Robert H. Bishop. Modern Control Systems.- Pearson; 14th edition, October 27, 2021.

# НЕЧЕТКИЙ АЛГОРИТМ СИСТЕМЫ УПРАВЛЕНИЯ ЛЕНТОЧНЫМ КОНВЕЙЕРОМ

**Огтай Мирзоев[1], Иджабика Сардарова[2], Эркин Джафаров[3]**
[1,2,3] Азербайджанский государственный университет нефти и промышленности
[1,2,3] кафедра “Электроника и автоматика”
[1]доктор технических наук, mmg51@mail.ru
[2]доктор технических наук, доцент, https://orcid.org/0000-0002-6906-5211, Email: bike.serdarova@mail.ru
[3]младший научный сотрудник, Email: erkinceferov@gmail.com

**РЕЗЮМЕ**

Исследованы особенности применения адаптивного нечеткого регулятора для системы автоматического управления (АИС) электрического привода ленточного конвейера на примере программируемого логического контроллера SIEMENS серии S7-1500.
Разработка базы знаний нечеткого регулятора состоит из решения следующих задач: 1) выбор входных лингвистических переменных на основе анализа поведения замкнутой системы управления в любом расчетном режиме; 2) определение набора лингвистических термов для каждой из лингвистических переменных; 3) подбор приближенного нечеткого множества для каждого из условий.
Основной функцией нечеткого регулятора является формирование выходного управляющего значения в зависимости от текущих координат системы.
Процедуру обработки ввода данных в контроллер можно описать следующим образом: 1) текущие значения входных переменных преобразуются в лингвистические значения (фаззификация); 2) на основе полученных лингвистических значений и с использованием базы правил контроллера принимается нечеткое логическое решение, в результате чего вычисляются лингвистические значения выходных переменных; 3) полученные значения преобразуются в четкие цифры.
Для обмена данными между пакетом моделирования MatLAB Simulink и программируемым логическим контроллером используется протокол OPC. Проведен сравнительный анализ переходных характеристик, полученных по результатам работы.
**Ключевые слова:** ленточный конвейер, нечеткая логика, ПИД-регулятор, электропривод.

Publication history

Article received: 16.11.2022
Article accepted: 30.11.2022
Article published online: 19.12.2022
DOI suffix: 10.36962/PAHTEI23122022-122



ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

# ACTIVITY OF BINARY Ce-Cu-O CATALYSTS BY THEIR ACID – BASE DEPENDENCE ON PROPERTIES

**Salıma Mammadova[1], Tunzala Ibrahımova[2]**
[1,2]Azerbaijan State Oil and Industry University, [1,2]Department "Chemistry and technology of inorganic substances",
[1]senior laboratory assistant, PhD student, Email: salimaabbaszade@mail.ru
[2]senior laboratory assistant, Email: tunzale.ibrahimova.91@mail.ru

## ABSTRACT

In the article, the study of ethanol dehydrogenation reaction on binary cerium-copper oxide catalysts was carried out. It was determined that ethanol in Ce-Cu-O catalysts is mainly acetic aldehyde, acetone, ethyl acetate, ethylene. and turns into carbon dioxide. Under the studied conditions, the products obtained in the reaction of isomerization of butene 1 to butene 2 in cerium-copper oxide catalysts are trans and cis-butene 2. At temperatures higher than 350C, deep oxidation products, namely CO and CO2, are formed. It was determined that with the increase in the amount of cerium in the catalysts, the release of trans and cis butene-2 decreases, which indicates a decrease in the acidity of the catalyst surface. It was determined that,

Studies have shown that in the Ce-Cu-O catalyst, ethanol is mainly converted to acetic aldehyde at low temperatures, ethyl acetate and acetic aldehyde and acetone at temperatures above 3500C.

As a result of the research, it was determined that cerium-copper oxide catalysts have little activity in the isomerization reaction of butene-1 to butene-2. In samples rich in cerium, the isomerization reaction of butene-1 starts at a temperature of 2500 C and does not exceed 15% of the yield of butene. The ratio of trans-cis isomers of Ce-Cu-Ocatalysts varies in the range of 0.17-0.56%. The isomerization of the catalyst in the same proportions is at least equal. In the reaction of isomerization of butene-1 to butene-2 at a temperature of 2500C, samples with a high content of copper show activity, at the same time, samples rich in cerium also show activity at a high temperature.

Heterogeneous catalytic reactions is a complex process involving the interaction of primary gas substances with a solid catalyst surface. It is known that the reaction speed is affected by the number of active centers. Therefore, increasing the number of active centers is an important issue in order to increase the activity of the catalyst. Determination of the specific surface of the synthesized catalysts was measured by nitrogen thermal desorption method. In Ce-Cu oxide catalysts, the specific surface first decreases with the increase in the amount of cerium in the catalyst, and then begins to increase. The sample under study is placed in a stream of mixture of helium and nitrogen, and then cooled to liquid nitrogen temperature. The partial pressure of nitrogen in the mixture was chosen in such a way that it was sufficient for monomolecular coating of the surface during cooling with liquid nitrogen. When the sample was heated to room temperature, desorption of nitrogen from its surface occurred and was recorded as a desorption peak on the tape of this self-recording device. As a result of the conducted research, there is enough complete and extensive information about the physico-chemical properties of catalysts in the scientific literature. However, no true theories have yet been proposed. Taking into account the above, the question of the possibility of predicting their activity, selectivity and longevity as a result of the study of various physico-chemical properties of catalysts is considered very important.

In the Ce-Cu= 3:7 sample, the specific surface decreases to 7.1 m2/g. At the ratio of 9:1, this indicator increases to 16.5 m2/ha. The values of the primary oxides, i.e., Ce and Cu oxides included in the catalytic system, were measured and are equal to 6.5 and 0.7 m2/g, respectively.
**Keywords:** ethanol, dehydrogenation acetaldehyde, binary catalysts, isomerization.

# BİNAR CE -CU-O KATALİZATORLARIN AKTİVLİYİNİN ONLARIN TURŞU – ƏSAS XASSƏLƏRİNDƏN ASILILIĞI

**[1]Səlimə Məmmədova, [2]Tünzalə İbrahimova**
[1,2]Azərbaycan Dövlət Neft və Sənaye Universiteti,[1,2] "Kimya və qeyri-üzvi maddələrin texnologiyası" kafedrası.
[1]böyük laborant, doktorant. Email: salimaabbaszade@mail.ru
[2]böyük laborant, Email: tunzale.ibrahimova.91@mail.ru

## XÜLASƏ

Məqalədə binar serium-mis oksid katalizatorları üzərində etanolun dehidrogenləşməsi reaksiyasının tədqiqi aparılmışdır. Müəyyən edilmişdir ki, Ce-Cu-O katalizatorlarında etanol əsasən sirkə aldehidi, aseton,etilasetat, etilen . və karbon dioksidə çevrilir. Öyrənilən şəraitdə serium-mis okid katalizatorlarında buten 1-in buten 2-yə izomerləşməsi reaksiyasında alınan məhsul trans və sis-buten 2-dir. 350C –dən yüksək temperaturda isə dərin oksidləşmə məhsulları yəni CO və$CO_2$ əmələ gəlir. Müəyyən edilmişdir ki, katalizatorların tərkibində seriumun miqdarının artması ilə trans və sis buten-2-nin çıxımı azalır ki, bu da katalizator səthinin turşuluğunun azalmasından xəbər verir. Müəyyən edilmişdir ki, serium-mis oksid katalizatorlarında etanolun dehidrogenləşməsinin səthin turşuluğunun artması ilə sirkə aldehidinin məhsuldarlığı və onun selektivliyi minimumdan keçir.
Tədqiqatlar göstərdi ki, Ce-Cu-O kaatalizatorunda etanol əsasən aşağı temperaturda sirkə aldehidi, etilasetata və $350^0$C- dən yüksək temperaturda sirkə aldehidi və aseton alınır.
Tədqiqatlar nəticəsində müəyyən olunuşdur ki, serium – mis oksid katalizatorları buten-1 buten 2-yə izomerləşməsi reaksiyasında kiçik aktivliyə malikdir.Seriumla zəngin olan nümunələrdə buten 1-in izomerləşməsi reaksiyası $250^0$ C temperaturdan başlayır və buten—nin çıxımının cəmi 15%- dən artıq olmur .Ce-Cu-Ovkatalizatorlarının trans-sis izomerlərinin nisbəti 0,17-0,56% intervalında dəyişir. Eyni nisbətlərdə olan katalizatorun izomerləşməsi minimum bərabərdir. $250^0$C temperaturda buten-1-in buten-2- yə izomerləşməsi reaksiyasında tərkibində misin miqdarı çox olan nümunələr aktivlik göstərir, eyni zamanda yüksək temperaturda tərkibi seriumla zəngin olan nümunələr də aktivlik göstərirlər.
Heterogen katalitik reaksiyalar ilkin qaz maddələrinin bərk katalizator səth ilə qarşılıqlı təsirini əhatə edən mürəkkəb bir prosesdir .Məlumdur ki, reksiyanın sürətinə aktiv mərkəzlərin sayı təsir göstərir.Ona görə də katalizatorun aktivliyini artırmaq üçün aktiv mərkəzlərin sayının artırılması vacib bir məsələdir.Sintez edilmiş katalizatorların xüsusi səthini təyin etmək üçün azotun istilik desorbsiyası üsulu ilə ölçülmüşdür.Ce-Cu oksid katalizatorlarında xüsusi səth katalizatorun tərkibində serium miqdarının artması ilə əvvəlcə azalır sonra artmağa başlayır.Ce-Cu= 3:7 nümunəsində xüsusi səth 7,1 $m^2$/q- a qədər azalır. 9:1 nisbətində isə bu göstərici 16,5 $m^2$/q-a qədər artır. O, katalitik sistemə daxil olan ilkin oksidlər yəni Ce və Cu oksidlərin qiymətləri




ölçülmüşdür və uyğun olaraq 6,5 və 0,7 $m^2/q$- a bərabərdir.
**Açar sözlər :** etanol, dehidrogenləşmə sirkə aldehidi, binar katalizatorlar, izomerləşmə.

## Giriş

Məlumdur ki, etanolun əsas çevrilmə reaksiyalarına oksidləşmə, dehidrogenləşmə, oksidləşdirici dehidrogenləşmə, dehidratasiya, dərin oksidləşmə və sair proseslər aid edilir. Bu reaksiyalar etilen, asetaldehid, sirkə turşusu, aseton, sadə, mürəkkəb efirlər, karbon qazı və karbon monooksid kimi dərin oksidləşmə məhsullarının əmələ gəlməsi ilə müşayiət olunur.
Dövri ədəbiyyatda etanolun dehidrogenləşmə və dehidratasiya reaksiyaları daim alimlərin diqqət mərkəzində olmuşdur. Həmin reaksiyaların köməyi ilə gələcəkdə etilasetat, asetaldehid və dietil efiri kimi qiymətli birləşmələr almaq mümkündür.
Hal-hazırda etanolun dünya üzrə istehsalının yarısından çoxu daxili yanma mühərrikləri üçün yanacaqlara (benzin) əlavə kimi, təxminən 15%-i isə spirtli içkilər istehsalı üçün istifadə olunur. Bu məqsədlə istifadə olunan etanolun istehsalının həcmi 1975-ci ildən dəyişməz olaraq qalır, eyni zamanda yanacaq kimi istifadə olunan etanolun istehsalı ildən-ilə artır. Bitki xammalından alınan etanolun istifadəsinin digər mühüm istiqaməti müxtəlif qiymətli kimyəvi monomerlərin sintezi hesab edilir (yaşıl kimya). ABŞ-da qəbul olunan dövlət proqramına əsasən,25 ildən sonra kimya sənayesinin təxminən 25%-i bitki mənşəli xammaldan alınan kimyəvi maddələrdən istifadə edilməlidir. Analoji proqram, həmçinin Avropanın inkişaf etmiş ölkələrində də qəbul edilmişdir. Etanol istehsalı üçün təkcə nişastadan deyil, həmçinin oduncağın, yarpaqların və samanın tərkibində olan sellüloza və sellobiozadan istifadə olunacaqdır. Sellüloza qalıqlarından benzin əvəzləyicisi və ya benzinə əlavə kimi istifadə ediləcək etanolun istehsalı böyük bioetanol ehtiyatı generasiya edəcəkdir.

## Məqsəd

**Problemin aktuallığı və əlaqəli tədqiqatlar.** Tədqiq edilmiş neft ehtiyatlarının qiymətləndirilməsi onun tükənməsi erasının yaxınlaşmasını göstərir.Buda dünyanın bir çox ölkələrində enerji sahəsində problemlər yaranmasına səbəb olacaqdır.Belə hesab edilir ki, neftin gələcək zamandakı alternativi biokütlədən alınan etanoldur. Binar mis tərkibli katalizatorlar üzərində etanolun dehidrogenləşməsi reaksiyası aparılmışdır.Mis əsasında katalizatorlar metanol sintezi sirkə aldehidinin alınması və s. çoxsaylı sənaye kimyəvi proseslərdə geniş tətbiq tapmışdır.Katalizatorların səthinin turşu-əsasi xassələri, dövri nəşrlərdən məlum olduğu kimi, onların katalitik fəaliyyətinə təsir göstərə bilər [1-3]. Muasir ehtimallara əsasən katalizatorun səthində turçu-əsas tipli Brensted və Lyuis mərkəzləri vardır. Bu baxımdan biz serium-mis tərkibli katalizatorların etanolun dehidrogenləşməsi reaksiyasında aktivliyinin onların turşu- əsas xassəlırindən asılılığını öyrənmişik ki, bu da buten-1-in buten-2-yə izomerləşmə sürəti ilə ölçülür.
Tədqiqatın məqsədi serium oksidli tərkibində mis olan binar oksid katalizatorlar üzərində etanolun dehidrogenləşdirlməsi reaksiyalarının öyrənilməsi, onların katalitik aktivliyi, fiziki-kimyəvi xassələri və katalizatorun təbiəti arasında qarşılıqlı əlaqənin aşkar edilməsidir.

## Metodlar

İşin yerinə yetirilməsində aşağıdakı üsullardan istifadə edilmişdir: qaz xromatoqrafiyası, rentgenfaza analizi, azotun istilik desorbsiyası üsulu ilə xüsusi səthin təyini və katalizatorların aktivliyini təyin etmək üçün axın qurğusu.

Serium -mis oksidi katalizatorları serium nitrat və mis nitrat duzlarının sulu məhlullarından birgə çökdürmə yolu ilə hazırlanmışdır. Nəticədə qarışıq 100-110°C-də buxarlanır, sonra əmələ gələn çöküntü 120-150°C-də qurudulur və sonra 300°C temperaturda azot oksidləri tam buraxılana qədər parçalanır. Yaranan bərk kütlə 10 saat ərzində 550°C temperaturda közərdilmişdir.

Beləliklə, Ce:Cu =1:9-dan Ce:Cu =9:1-ə qədər elementlərin atom nisbətinə malik 9 katalizator sintez edilmişdir.

Tədqiq edilən katalizatorlar üzərində buten1-in buten 2-yə izomerləşməsi reaksiyasını aparmaq üçün axınlı laboratoriya quröusunda inteqral reaktoru istifadə edilmişdir. İzomerləşmə reaksiyasının tədqiqi üçün reaktora plçüsü 1-2 mm olan 5 ml katalizator doldurulur. Buten_1-in buten-2 – yə izomerləşməsi etanolun dehodrogenləşməsi reaksiyasında və sintez edilmiş katalizatorların aktivliyi 150-450°C temperatur diapazonunda 1200 h-1 həcmi sürətində axın qurğusunda tədqiq edilmişdir. Asetaldehid, aseton və digər üzvi birləşmələrin məhsuldarlığı Polisorb-1 sorbenti ilə doldurulmuş 2 m-lik sütunda alov ionlaşma detektoru ilə LKhM-8 xromatoqrafında təyin edilmişdir. Karbon dioksid və buten-2-nin məhsuldarlığı 6 m uzunluğunda sütunlu Qazoxrom xromatoqrafında təyin edilmişdir. Reaktor binar katalizatorla doldurularaq buten 1- ilə azot qarışığı bu reaktora daxil olur və burada izomerləşmə prosesi baş verir.

Aparılmış tədqiqatlar göstərmişdir ki, serium-mis oksid katalizatorlarında etanolun dehidrogenləşməsinin reaksiya məhsulları asetaldehid, aseton, karbon dioksid, etilen, etilasetat və az miqdarda ilkin spirtin üzvi parçalanma məhsullarıdır.

Etanolun çevrilmə reaksiyasında Ce-Cu=3-7 katalizatorunun aktivliyinin öyrənilməsinə dair məlumatlar Cədvəl 1-də göstərilmişdir. Göründüyü kimi, etanolun dehidrogenləşdirilməsi reaksiyası da 150°C-də başlayır. Bu temperaturda 10,6% asetaldehidin əmələ gəlməsi müşahidə olunur. Temperatur artdıqca asetaldehidin çıxımı 300°C-də maksimumdan (42,8%) keçir. Temperaturun daha da artması karbon qazının, asetaldehidin, etilenin və etil asetatın əmələ gəlməsinə səbəb olur.

**Cədvəl 1.** Ce-Cu=3:7 katalizatorunda etanolun dehidrogenləşməsi

| T, °C | Çıxım, % | | | | | Konversiya |
|---|---|---|---|---|---|---|
| | CO+CO2 | Etilen | Sirkə aldehidi | Aseton | etil asetat | |
| 150 | | | 10.6 | | | 10.6 |
| 200 | | | 16.6 | | | 16.6 |
| 250 | 0 | 0.3 | 26.9 | 0 | 25 | 65.2 |
| 300 | 3.6 | 5.4 | 42.8 | 2.9 | 10,5 | 47.6 |
| 350 | 7.5 | 8.2 | 33.8 | 12.5 | 8,7 | 70.7 |
| 400 | 16.4 | 3.9 | 28.7 | 12.5 | 2.5 | 65.7 |
| 450 | 28 | 1.9 | 30.9 | 9.4 | 4.5 | 74.7 |

Etil asetatın əmələ gəlməsi 250°C temperaturda müşahidə edilir və onun çıxımı, cədvəl 1-dən göründüyü kimi, 25%-dən çox deyil. Asetaldehid əmələ gəlməsi reaksiyası 150°C-də başlayır və artan temperaturla 300°C-də maksimumdan (42,8%) keçir. Etilen məhsulu da artan reaksiya temperaturu ilə maksimumdan keçir və onun ən yüksəhsulu 350°C-də 8,2% təşkil edir. Karbon dioksidin əmələ gəlməsi 300°C-də başlayır və tədqiq olunan bütün temperatur diapazonunda reaksiya temperaturunun artması ilə onun məhsuldarlığı artır. Cədvəl- 1 də tədqiq edilən katalizatorda etanolun dehidrogenləşdirilməsi reaksiyasında 450°C-də konversiyası 74,7%-ə


ISSN: 1609-1620, E-ISSN: 2674-5224
P A H T E I
REFEREED & REVIEWED JOURNAL

çatdığını göstərir.
Buten-1-in buten-2-yə izomerləşməsinin tədqiqi göstərdi ki, serium-mis oksid katalizatorları buten-1-in trans və sis-buten-2-yə izomerləşməsində kifayət qədər aşağı aktivliyə malikdir. Məlum olmuşdur ki, Ce-Cu=3:7 katalizatorunda buten-1 izomerləşməsi 200°C temperaturda başlayır. Bu temperaturda müvafiq olaraq 2,5 və 4,7% trans və sis buten-2 əmələ gəlir. Reaksiya temperaturunun artması ilə 2-butenlərin məhsuldarlığı bir qədər artır və 300 ° C reaksiya temperaturunda 12,5% -ə çatır. Temperaturun daha da artması 400°C-də 2-butenlərin çıxımının 6,1%-ə qədər azalmasına səbəb olur. Digər anoloji nümunələr üçün nəticələr əldə edilmişdir.
Aparılan tədqiqatlar göstərmişdir ki, tədqiq edilən bütün katalizatorlar üzrə buten-2- nin ümumi çıxımı 10,6%-dən çox deyil. Tədqiq olunan katalizatorlarda buten-2-nin trans və sis izomerlərinin çıxımının nisbəti 0,35-0,71 arasında dəyişir.Bu onu göstərir ki. Katalizatorun səthində həm Lyuis və Brensted turşu mərkəzləri mövcuddur.Lyuis turşu mərkəzləri Brensted turşu mərkəzlərinə nisbətən 2 dəfə çoxdur Alınan məlumatlardan demək olar ki, izomerləşmnin sürəti katalizatorun tərkibində seriumun misə olan atom nisbətindən güclü şəkildə asılıdır.
Şəkil 1-də trans və sis buten-2-nin məhsuldarlığının 250°C-də Ce-Cu-O katalizatorlarının tərkibindən asılılıqları göstərilir. Şəkil 1-dən göründüyü kimi katalizatorların tərkibində seriumun miqdarının artması ilə trans və sis buten-2-nin çıxımı Ce-Cu=3:7 nümunəsində 12,1%-dən 1.6 %-ə qədər azalır. Ce-Cu=9-1 katalizator. Cədvəldən də göründüyü kimi karbon qazının çıxımı reaksiya temperaturunun artması ilə öyrnilən bütün temperature intervalı boyu aartır. Karbon dioksidin maksimal çıxımı $450^0$ C temperaturda 28% təşkil edir.
Cədvəldən alınan nəticələrdən məlum olur ki etanolun konversiyası terkibdən asılı olaraq dəyişir. Bu katalizator nümunəsində etilenin çıxımı temperaturda həm də seriumun misə olan atom nisbətindən asili olaraq 350 $^0$C temperatura qədər artır sonar azalma müşahidə olunur.
Məlum olduğu kimi, heterogen katalizatorların səthinin turşu-əsas xüsusiyyətləri onların aktivliyinə təsir göstərir. Sirkə aldehidi və karbon dioksidin çıxımı , eləcə də etanolun sirkə aldehidənə dehidrogenləşməsi və selektivliyi serium-mis oksid katalizatorlarında buten-1-in izomerləşmə dərəcəsindən asılılığı Şəkil 2-də göstərilmişdir.
Şəkildə, asetaldehidin çıxımı və asetaldehidə görə selektivliyi izomerləşmə dərəcəsinin dəyişməsi ilə eyni istiqamətdə baş verir. Buten-1 –in izomerləşmə dərəcəsinin artması ilə asetaldehidin çıxımı və selektivliyi əvvəlcə bir qədər azalır, sonra isə artmağa başlayır. Eyni zamanda, buten-1-in izomerləşmə dərəcəsinin artması ilə karbon dioksid maksimum çıxım göstərir. Şəkil 2 də göstərir ki, buten-1-in izomerləşmə dərəcəsinin artması ilə etanolun çevrilməsi bir qədər artır.
Heterogen katalizatorların səthinin turşu-əsasi xassələri onların katalitik xassələri ilə korrelyasiya olunur. Bununla əlaqədr olaraq etanolun dehidrogenləşdirilməsi reaksiyasında binary mis tərkibli katalizatorların aktivliyinin onların turşuluğundan asılılığını öyrənilmişdir.
Termodinamiki tədqiqatlar əsasında müəyyən edilmişdir ki, sirkə aldehidi və etilasetatın əmələ gəlməsilə etanolun dehidrogenləşmə reaksiyasını 250-350$^o$C temperatur intervalında aparmaq məqsədəuyğundur. Etanolun dehidrogenləşdirilməsi prosesində sintez edilmiş binar birləşmələrin aktivliyinin öyrənilməsi nəticəsində etilasetatın və sirkə aldehidinin əmələ gəlməsi reaksiyasında binar serium-mis və xrom-mis oksid, asetonun sintezində isə serium-mis ilə yanaşı sink-mis oksid katalizatorlarının aktiv olması müəyyən edilmişdir.

**Şəkil 1.** Ce-Cu-O katalizatorlarının tərkibində trans və sis buten-2 məhsullarının seriumun misə atom nisbətindən asılılığı. T=250C:1 – trans və sis butenlərin cəmi-2; 2 - t-buten-2; 3 - c-buten-2; 4 - t-buten-2-nin c-buten-2 nisbəti

ISSN: 1609-1620, E-ISSN: 2674-5224
P A H T E I
REFEREED & REVIEWED JOURNAL

E-ISSN: 2674-5224
VOLUME 23 ISSUE 12 2022




**Şəkil 2.** Etanolun dehidrogenləşməsi reaksiyasında serium-mis katalizatorlarının aktivliyininbuten-1-in buten-2-yə izomerləşmə dərəcəsindən asılılığı. T=300°C:1 - Selektivlik; 2 - konversiya; 3 - sirkə aldehidi; 4 - CO + CO2

**Nəticə**

1. Serium-mis oksid katalizatorlarında etanol dehidrogenləşməsinin reaksiya məhsulları sirkə aldehidi, etil asetat, aseton, etilen və karbon dioksiddir.
2. Serium-mis oksid katalizatorları buten-1-in trans və sis-buten-2-yə izomerləşməsində aşağı aktivliyə malikdir.
3. Serium-mis oksidi katalizatorlarında etanolun dehidrogenləşməsi reaksiyasında sirkə aldehidin əmələ gəlməsi orta qüvvətli turşu mərkəzlərdə baş verir.




4. Serium –mis oksid katalizatorlarının aktivliyi həm temperaturdan həm də seriumun misə olan atom nisbətindən asılıdır.

## ƏDƏBİYYAT


1. Sidorenko A.Yu., Senkov GM, Agabekov VE Effect of acid treatment on the composition, structure and catalytic properties of natural aluminosilicate in the α-pinene isomerization reaction. // Catalysis in industry, 201 Zbuzek, M. The physico-chemical structure and activity of hydrodesulphurization catalysts aged by accelerated method / M. Zbuzek, A.Vráblík, V.Tukač [et al.] // A Catalysis Today ,- Amsetrdam: Elseiver, 2015. November.1. v. 256, Part 2,- p. 261–268
2. Zieliński, M. The catalytic and physico-chemical properties of Ni/MgF2–MgO catalysts / M. Zieliński // Applied Catalysis A: General ,- Amsetrdam: Elseiver, 2012.December 27. v. 449, - p. 15–22
3. Zhang, H. Highly efficient and robust Cu catalyst for non-oxidative dehydrogenation of ethanol to acetaldehyde and hydrogen / H. Zhang, H.R. Tan, S. Jaenicke [et.al.] // Journal of Catalysis Chadaporn,- Krutpijit: -2020. v. 389, -p. 19-28
4. Zhang, J. Role of acidity in catalytic cracking of n-decane over supported Pt-based catalysts //J. Zhang, T. Chen, Y. Jiao [et al.] // Applied Surface Science.-2020. v. 507, - 145113
5. Zhao, Y. Structure evolution of mesoporous silica supported copper catalyst for dimethyl oxalate hydrogenation / Y. Zhao, Y. Zhang, Y. Wang [et al.] // Applied Catalysis A: General, - Amsetrdam: Elseiver, 2017, v. 539, –p. 59-69
6. Waele, J.D. PdZn nanoparticle catalyst formation for ethanol dehydrogenation: Active metal impregnation vs incorporation / J. D. Waele, V. V. Galvita, H. Poelman [et al.] // Applied Catalysis A: General, Amsetrdam, 2018. v. 555, - p. 12-19
7. Wisaijorn, W. Reduction of carbon dioxide via catalytic hydrogenation over copper-based catalysts modified by oyster shell-derived calcium oxide / W. Wisaijorn, Y. Poo-arporn, P. Marin [et al.] // Journal of Environmental Chemical Engineering. -2017, v. 5, Issue 4, -p. 3115-3121
8. Wu, R. Lichang Wang. Unveiling alloying effects on the catalytic activities of Cu3Pt and Cu3Pd for nonoxidative dehydrogenation and esterification of ethanol / R. Wu, L. Wang // Computational Materials Science. -2021, v. 196, 110514
9. Autthanit, C. Elucidation of Pd modification effect on catalytic behaviors of γ-Al2O3-P catalysts toward ethanol dehydration and dehydrogenation / C.Autthanit, C.Khaochartchai, P.Praserthdam [et al.] // Catalysis Communication,- Amsetrdam: Elseiver, 2021. v. 148, 106169


## АКТИВНОСТЬ БИНАРНЫХ Ce-Cu-O КАТАЛИЗАТОРОВ ПО ИХ КИСЛОТНО-ОСНОВНОЙ ЗАВИСИМОСТИ ОТ СВОЙСТВ

**Салима Мамедова, Тунзале Ибрагимова**
[1,2]Азербайджанский государственный университет нефти и промышленности, [1,2]кафедра "Химия и технология неорганических веществ"
[1]старший лаборант, докторант, Email: salimaabbaszade@mail.ru

[2]старший лаборант, Email: tunzale.ibrahimova.91@mail.ru

**РЕЗЮМЕ**

В статье проведено исследование реакции дегидрирования этанола на бинарных оксидно-церий-медных катализаторах. Установлено, что этанол в катализаторах Ce-Cu-O в основном представляет собой уксусный альдегид, ацетон, этилацетат, этилен. и превращается в углекислый газ. В исследованных условиях продуктами реакции изомеризации бутена 1 в бутен 2 на цериево-медных оксидных катализаторах являются транс- и цис-бутен 2. При температурах выше 350С образуются продукты глубокого окисления, а именно CO и CO2. Определено, что с увеличением количества церия в катализаторах снижается выход транс- и цис-бутена-2, что свидетельствует о снижении кислотности поверхности катализатора. Было определено, что,

Исследования показали, что в катализаторе Ce-Cu-O этанол в основном превращается в уксусный альдегид при низких температурах, этилацетат и уксусный альдегид и ацетон - при температурах выше 350°C.

В результате исследований установлено, что цериево-медные оксидные катализаторы малоактивны в реакции изомеризации бутена-1 в бутен-2.В образцах, богатых церием, реакция изомеризации бутена-1 начинается при температуре 2500 С и не превышает 15% выхода бутена Соотношение транс-цис-изомеров Се-Си-О катализаторов колеблется в пределах 0,17-0,56%. Изомеризация катализатора в тех же пропорциях, по крайней мере, равна. В реакции изомеризации бутена-1 в бутен-2 при температуре 2500С активность проявляют образцы с высоким содержанием меди, в то же время образцы, богатые церием, также проявляют активность при высокой температуре.

Гетерогенные каталитические реакции представляют собой сложный процесс взаимодействия первичных газообразных веществ с твердой поверхностью катализатора.Известно, что на скорость реакции влияет количество активных центров, поэтому увеличение числа активных центров является важным вопросом для для повышения активности катализатора.Определение удельной поверхности синтезированных катализаторов измеряли методом термодесорбции азота.У оксидных Ce-Cu катализаторов удельная поверхность сначала уменьшается с увеличением количества церия в катализаторе, а затем начинает возрастать В образце Ce-Cu=3:7 удельная поверхность уменьшается до 7,1 м2/г. При соотношении 9:1 этот показатель увеличивается до 16,5 м2/га. Величины первичных оксидов, т.е. оксидов Ce и Cu, входящих в каталитическую систему, измерены и равны 6,5 и 0,7 м2/г соответственно.

**Ключевые слова:** этанол, дегидрирование ацетальдегида, бинарные катализаторы, изомеризация.

Publication history

Article received: 16.11.2022
Article accepted: 01.12.2022
Article published online: 19.12.2022
DOI suffix: 10.36962/PAHTEI23122022-129

E-ISSN: 2674-5224

137-146 VOLUME 23 ISSUE 12 2022



ISSN: 1609-1620, E-ISSN: 2674-5224

PAHTEI

REFEREED & REVIEWED JOURNAL

# MINERAL COMPOSITION OF ORES AND ROCKS OF THE DURUJA STRUCTURAL-FORMATION ZONE

**Teller Gadirova**

Institute of Geology and Geophysics, of ANAS, Department of "Ore Magmatic Systems and Minerageny"
Researcher, e-mail: qedirova1980@mail.ru

## ABSTRACT

Investigating the potential of precious, non-ferrous metals, rare and rare earth elements accumulated in black shales is of great scientific and practical importance. The characteristics of these rocks such as barrier, sorption, transport, reduction are important in the formation of anomalies of similar elements in black shales and in their role as a source in epigenetic processes. For example, "Muruntau" field, which has 6 thousand tons of gold reserves, located mainly in Proterozoic-Paleozoic and Mesozoic black shale complexes in Uzbekistan, unique deposits formed in the black shale strata of "Pay-Khoy", deposits in a similar complex with large reserves in RSA, USA, Australia, Canada and Indonesia.

From this point of view, the study of the mineral composition of the ores and rocks of the Duruja zone, which mainly consists of Middle Jurassic aspide schists and terrigenous flyschoid formations, is a promising direction.

The study of sections and polished-sections, which were made from numerous samples taken from the research area, was conducted in transmitted and reflected rays under the microscopes MIN-8 and MIN-9, Carl ZEISS Axio imager A2m, and the images were captured on a computer using Zen 2.6 Software. Monominerals were disaggregated under a MBC-1 binocular microscope and the analysis of their element-compounds was carried out by the X-ray-fluorescent method in the "PICOFOX" analyzer. The samples were accurately determined by using the X-ray spectral method in the "SEM" electron microscope in order to investigate the distribution of impurity components in ore and non-metallic minerals, the surface area and morphological characteristics of some minerals.

Ore and non-metallic mineral compounds of the rocks were studied based on the research conducted on the samples taken from different mineralization areas of the Duruja zone. It was determined that clay minerals, phosphates, carbonate minerals, sulphide compounds play an important role in the accumulation and distribution of precious and non-ferrous metals, rare and rare earth elements in black shales, sandstones, siltstones.

The black shales of the Duruja zone are characterized by high amounts of clay minerals (montmorillonite (7.8%), kaolinite (6.8%) and illite (7.4%)), barite (7%), chlorite (12%) and others. The mineral composition of sandstones is characterized by superior quantities of quartz (40.1%), hydromica (8.78%), jarosite (7.5%) and feldspar (11.9%) compared to the mineral composition of black shales. Siltstones are dominated by feldspars (14.9%), calcite (11.9%), and hydromica (14.4 %). These observed differences in mineral composition depend on rock materials of petrogenic and aquagenic sources, transport characteristics and physicochemical parameters of mineralization during sediment accumulation.

Comparative study of ions sorption of copper, zink, cobalt, nickel and silver on the example of black shale rock from Duruji zone of the Greater Caucasus South Slope (Azerbaijan) which is multimineral system with the following components – montmorillonite, illite, chlorite, albite, gypsum, quartz, pyrite, carbon – base matter demonstrated that test sample possesses a high

sorption ability towards the ions of abovementioned metals. This means the sorption ability of black shale rocks towards different metals can be basis in prediction and search for zones with concentration of one or a number of metals.
**Key words:** shale**,** rock, mineral, ore, microscope

# DURUCA STRUKTUR-FORMASİYA ZONASININ FİLİZLƏRİNİN VƏ SÜXURLARININ MİNERAL TƏRKİBİ

**Tellər Qədirova**
AMEA Geologiya və Geofizika İnstitutu, "Filiz maqmatik sistemləri və minerageniya" şöbəsi
Elmi işçi, e-mail: qedirova1980@mail.ru

## XÜLASƏ

Qara şistlərdə nəcib, əlvan metalların, nadir və nadir torpaq elementlərinin toplanması baxımından potensialının araşdırılması mühüm elmi-praktiki əhəmiyyət kəsb edir. Bu süxurların baryer, sorbsiya, dasıma, bərpaedici kimi xüsusiyyətləri qara şistlərdə anoloji elementlərin anomaliyalarının yaranmasında və bu süxurların epigenetik proseslərdə mənbə kimi rol oynamasında mühüm əhəmiyyət kəsb edir. Bunlara Özbəkistanda əsasən proterozoy- paleozoy və mezozoy yaşlı qara şist komplekslərində yerləşən 6 min ton qızıl ehtiyatına malik olan "Muruntau" yatağı, "Pay-Xoy" un qara şist qatında formalaşan unikal yataqlar, CAR, ABŞ, Avstraliya, Kanada və İndoneziyada böyük ehtiyata malik olan analoji kompleksdəki yataqlar misal ola bilər.
Bu nöqteyi-nəzərdən tədqiqat obyektimiz – əsasən orta yuranın aspid şistləri və terrigen-flişoid formasiyalarının süxurlarından ibarət olan Duruca zonasının filizlərinin və süxurlarının mineral tərkiblərinin tədqiqi perspektivli bir istiqamətdir.
Tədqiqat zonasından götürülmüş çoxsaylı nümunələrdən hazırlanmış şlif və anşliflərin öyrənilməsi uyğun olaraq keçən və əks olunan şüalarda MİN-8 və MİN-9, Carl ZEİZZ Axio imager A2m mikroskoplarında aparılmış və şəkillər Zen 2.6 Proqramı vasitəsilə kompüterdə çəkilmişdir. MBC-1 markalı binokulyar mikroskopun altında monominerallar ayrılmış və onların element-qarışıqlarının analizi rentgen-fluoressent üsulu ilə "PICOFOX" markalı analizatorda yerinə yetirilmişdir. Filiz və qeyri-filiz minerallarında qatışıq komponentlərin paylanmasını, bəzi mineralların səthi ölçüləri və morfoloji xüsusiyyətlərinin araşdırılması məqsədilə nümunələr "SEM" markalı elektron mikroskopu vasitəsilə rentgen-spektral metodundan istifadə etməklə dəqiq təyin edilmişdir.
Duruca zonasının müxtəlif filizləşmə sahələrindən götürülmüş nümunələrin üzərində aparılan tədqiqatlara əsasən süxurların filiz və qeyri-filiz mineral tərkibləri öyrənilmişdir. Qara şistlərdə, qumdaşlarında, alevrolitlərdə nəcib, əlvan metalların, nadir və nadir torpaq elementlərinin toplanmasında və paylanmasında gil minerallarının, fosfatların, karbonat minerallarının, sulfid birləşmələrinin mühüm rol oynadığı müəyyən edilmişdir.
**Açar sözlər:** şist, süxur, mineral, filiz, mikroskop.

### Giriş

İqtisadi problemlərin həll etməyin rasional yollarından biri də faydalı qazıntı yataqlarında və onların yerləşdiyi süxurlarda, xüsusi ilə də geniş spektrli qara şistlərdə əlvan, nəcib metalların,

nadir və nadir torpaq elementlərin yeni, qeyri-ənənəvi ehtiyatlarının aşkara çıxarılması ola bilər. Dünyada manqan, kolçedan, mis, polimetal, qızıl, molibden, vanadium və uranın bir sıra iri yataqları qara şistlər içərisində yerləşir [1].

Eyni zamanda sübut edilmişdir ki, qara şistlərin kömürdaşıyan layları və ya hətta qara şıstlərin özləri bəzi hallarda əlvan, nadir və nəcib metalların kompleks potensial mənbəyi ola bilər. Qara şistlərdə, eyni zamanda filizlərdə nəcib, əlvan metalların, nadir və nadir torpaq elementlərinin toplanması baxımından potensialının araşdırılması mühüm elmi-praktiki əhəmiyyət kəsb edir.

Azərbaycanda bu tip süxurların və filizlərin mineraloji xüsusiyyətlərinin öyrənilməsi məqsədi ilə Böyük Qafqazın cənub yamacının Azərbaycan kəsimində yerləşən Duruca struktur-formasiya zonasında tədqiqat işləri aparılmışdır. Tədqiqat obyekti şimal-qərbdən Ləkit, cənub-şərqdən Sulut çayları ilə hüdudlanaraq, şimaldan Zaqatala-Qovdağ cənubdan Vəndam zonaları arasında aralıq mövqe tutur, 200 km-ə qədər məsafədə izlənilir .



**a)** **b)**

**Şəkil 1.** a) aspid formasiyasının çöküntüləri b) flişoid formasiyasının çöküntüləri

Orta yuranın terrigen-flişoid formasiyasının çöküntüləri uzanma istiqaməti boyunca şimaldan üst yuranın və alt tabaşirin terrigen-karbonat süxurlarından Qaynar qırılması ilə, cənubdan isə tuflu qumdaşlarının, tuflu-qravelitlərin, tuflu-konqlomeratların, silisiumlu arqillitlərin, nadir hallarda tufların, andezit və andezit-dasit porfiritlərin tuflu-lavaların, tuffitlərin və yuvarlaq pelitomorf əhəng daşlarının layvari toplantılarından ibarət olan üst təbaşirin vulkanogen-çökmə formasiyası qatından Zəngi qırılması ilə ayrılır. Duruca zonasının geoloji quruluşunda aspid və terrigen-flişoid formasiyaları ilə təmsil olunan orta yuranın aalen mərhələsinin süxurları iştirak edir (**şəkil 1**).

Tədqiqat onasında şimali-qərbdən cənubi-şərqə doğru Qum-Ləkit, Baş Laysk, Qızılqaya, Ağlıq-Filfilli, Qəmərvan, Qalacıq və başqa filizləşmə sahələri ayrılıb.

Hər bir sahənin ayri-ayri süxurları (gil şisti, qumdaşı, alevrolit) və filizləri kompleks tədqiqatlar nəticəsində öyrənilmişdir.

## Məqsəd

Duruca struktur-formasiya zonasında nəcib, əlvan metalların, nadir və nadir torpaq elementlərin yayılma formalarını, toplanma sahələrini aşkar etmək məqsədi ilə süxurların və filizlərin mineral tərkiblərini öyrənməkdən ibarətdir.

## Metodlar

Tədqiqatlar çöl və laboratoriya metodlarının əsasında aparılmışdır. Çöl tədqiqatları minerallaşma müşahidə olunan müxtəlif sahələrdən geoloji kəsilişlər üzrə, GPS-lə koordinantları qeyd etməklə geokimyəvi nümunələr götürülərək həyata keçirilmişdir. Nümunələr nöqtəvi və şırım üsulları ilə götürülmüşdür.

Nümunələr götürülən zaman Niton markalı portativ rentgen-fluoressent analizatorundan istifadə etməklə ilkin analitik məlumatları çöl şəraitində birbaşa süxur və ya minerallaşma səthlərinə toxunmaqla 2 dəqiqə ərzində D. Mendeleyev cədvəlində olan natriumdan urana qədər elementlərin miqdarını təyin etməklə ilkin analitik məlumatları çöldə əldə etməyə imkan verir və nəticə etibarı ilə maraq oyatmayan nümunələrin götürülməsinə ehtiyac qalmır. Toplanmış nümunələrdən müxtəlif metodlarla tədqiqatlar aparmaq üçün şlif və anşliflər hazırlanmış və məqsədə uyğun olaraq narın toz halına gətirilmis, difraktometrik, silikat, kimyəvi element analizləri olunmuş, süxur və filizlərin element-qarışıqları rentgen- spektral metodu ilə təyin edilmişdir. Nümunələrdə karbonlu maddənin olması və onun miqdarı termoqrafik və İQ - spektrofotometrik üsulla təyin olunmuşdur. Qara şistlərdən keçən məhlulların pH və Eh parametrləri pH-metrlə (pH-420) ölçülmüş və Elit ionometrlə kontrol edilmişdir.

Filizləşmə müşahidə olunan zonalardan götürülmüş nümunələrdə nəcib elementlərin kimyəvi analizləri atom absorbsiya metodları ilə yerinə yetirilmişdir.

**Filiz və qeyri-filiz minerallarının təsviri**

Pürüz, damarcıq-pürüz, zolaqlı, ləkəli, massiv, brekçiyavari formalı teksturlu, qlobulyar, hipidiomorfdənəli, allotriomorfdənəli, relikt, konsentrik- zonal, radial-şüalı, haşiyə strukturlu tipləri eyni zamanda krujeva və lələkvari formalı gül kələmə və arı şanına bənzəyən, təsbehvari düzülmüş və s. əmələgəlmələri ilə müşahidə olunan çox sadə mineral tərkibi ilə səciyyələnən, filizlərin ən geniş yayılan mineralı piritdir (şəkil 2).

Əsasən müxtəlif ölçülü kub formalı kristallar şəklində təzahür edir və mineral aqreqatlarının formalarının zənginliyi ilə diqqəti cəlb edir [2]. Qırılma zonalarından götürülmüş nümunələrdə tez-tez piritin dinamometamorfizmə uğraması nəticəsində yaranan çoxsaylı çatlarla örtülməsi müşahidə olunur. Göstərilən mineralın geoloji ədəbiyyatda “filizləşmiş bakteriyalar” ,“qlobulitlər”, “sferolitlər”, “framboidlər”, “kürülü pirit”, “kolçedan kürələri” kimi adlandırılan belə aqreqatlarına tədqiqat zonasının süxurlarında da tez-tez rast gəlinir.



**Şəkil 2.** Pirit aqreqatlarının mikroskopik görüntüləri.

E-ISSN: 2674-5224
VOLUME 23 ISSUE 12 2022

ISSN: 1609-1620, E-ISSN: 2674-5224
PAHTEI
REFEREED & REVIEWED JOURNAL

Kimyəvi aşındırma aparmadan göstərilən aqreqatların elektron mikroskopu altında 5500 dəfəyədək və daha çox böyüdülməsi belə strukturları daha aydın müşahidə etməyə imkan yaradır (şəkil 2). Tək-tək rast gələn qlobulitlərlə yanaşı tez-tez onların topluları – koloniyaları da müşahidə edilir. Bəzi tədqiqatçılar belə aqreqatların biogen mənşəli olduğunu göstərir və onları piriti generasiya edən mikroorqanizmlərə və ya ölmüş mikroorqanizmlər üzrə yaranan metasomatik əmələgəlmələrə aid edir [3]. Analoji aqreqatların abiogen yolla formalaşmasının da mümkünlüyü – onların hidrotermal mənşəli sulfid gellərindən yarandığı da göstərilir. Duruca zonasının filizlərinin aparıcı mineralı olan piritin müxtəlif mənşəli və formalı dənələrinin elektron-mikroskopik analizinlərinin nəticələrindən göründüyü kimi singenetik və epigenetik piritlər həm qatışıq elementlərin spektrinə, həm də miqdarına görə fərqlənir. Singenetik mənşəli qlobulyar pirit aqreqatlarının tərkibində Au, Ag və Se kimi qatışıq elementlər iştirak edir [4]. Piritin belə aqreqatlarında selen və gümüşün üstün qiymətlərə malik olması elektron-mikroskopik tədqiqatlarda müəyyən olunmuşdur. Epigenetik piritlərdə isə yüksək konsentrasiya ilə səciyyələnən qızılla yanaşı singenetik piritdən fərqli olaraq xrom, qadolinium, sink və kobalt qatışıqlarıda aşkar edilmişdir. Göstərilən piritlər Qum-Ləkit və Ağlıq-Filfilli filizləşmə sahələrindən götürülmüş nümunələrdə qeyd olunmuşdur.

Oksidləşməyə məruz qalmış piritin aqreqatları üzrə hötit, hidrohötit, hidrohematit kimi törəmə dəmir mineralları psevdomorfozalar yaradır (şəkil 5). Göstərilən hipergen minerallar tərəfindən pirit tam əvəz edilmədikdə bu törəmə minerallar içərisində onun reliktləri qorunub saxlanılır.Çox vaxt piritin kub formalı dənələri üzrə inkişaf edən dəmir hidrosidləri onların görünüsünü qoruyub saxlayaraq özləri də bu formada təzahür edir.

Sfalerit digər əlvan metal sulfidlərinə - qalenitə və xalkopiritə nisbətən miqdarca üstünlük təşkil etsə də, ümumiyyətlə filizlərdə az yayılmışdır. Tədqiqat apardığımız filizləşmə sahələrinin bəzilərində aşkar olunmuş sfalerit qalenit və xalkopiritlə bir paragenetik assosiasiyada qeyri - düzgün formalı kiçik aqreqatlar şəklində qeyd olunur (şəkil 3). Mikroskop altında çar arağının buxarları ilə aşındırdıqda onun aqreqatlarının allotriomorfdənəli strukturla səciyyələndiyi aşkar olunur.




**Şəkil 3.** Qalenit, sfalerit, pirit və xalkopirit mineral assosiasiyalarının mikroskopik təsviri

Qalenitin qeyri-düzgün formalı əmələgəlmələri sfalerit və xalkopiritlə assosiasiya təşkil edir və piritin aqreqatları arasında yerləşərək onları korroziyaya uğradır (şəkil3). Paragenetik assosiyasiya şəklində təzahür edən sfalerit və qalenitin tərkibində mis və qadolinium kimi qatışıq komponentlər iştirak edir. Qalenitdə orta-hesabi miqdarı 1,01% olan gümüşlə yanaşı həmçinin Co, Cr və Se, sfaleritdə isə indium (1,01%) qatışıqları aşkar edilmişdir. Göstərilən mineralların tərkibində bu elementlərin bəziləri izomorf formada, digərləri isə mexaniki qatışıq kimi iştirak edir. Xalkopiritin tərkibində qatışıq elementlərdən qızıl, qurğuşun və xrom aşkar edilmişdir.

